# Mündəricat



## Şərq ölkələri XVII–XVIII yüzilliklərdə












Dərslikdəki **QR kodlara** müraciət edərək mövzu ilə əlaqədar daha çox maraqlı məlumat əldə edə bilərsiniz.

## Avropa və Amerika XVII–XVIII yüzilliklərdə





Şərti işarələr




Sual




Tapşırıq




Maraqlıdır





# Əziz məktəblilər!

Siz 7-ci siniflər üçün Ümumi tarix dərsliyində feodal münasibətlərinin meydana gəlməsi, erkən feodal dövlətlərinin yaranması, Şərqdə və Avropada siyasi pərakəndəliyin xüsusiyyətləri, mərkəzləşdirilmiş dövlətlərin yaradılması, Böyük coğrafi kəşflər, müstəmləkə işğallarının başlanması və dünya mədəniyyətinin inkişafına təsir göstərən mühüm hadisələr barədə biliklər əldə etmişsiniz. 8-ci sinif dərsliyində XVII–XVIII yüzilliklərdə Dünya tarixində baş verən əsas tarixi faktlar və proseslər öz əksini tapmışdır. Yeni ictimai-iqtisadi münasibətlərin bərqərar olması müstəmləkələr uğrunda aparılan kəskin mübarizə şəraitində baş verir. Burjuaziyanın öz hüquqları uğrunda mübarizəsi, kapitalist münasibətlərinin inkişafı inqilabların baş verməsi ilə nəticələnir. Monarxların mütləq hakimiyyətinin devrilməsi demokratik dəyərlərin möhkəmlənməsinə təkan verir. Hakimiyyət bölgüsünün baş verməsi və xalqın onun əsas mənbəyi olması ideyasının formalaşması vətəndaş cəmiyyətinin qurulması və hüquqi dövlətin yaradılması yolunda mühüm addım olur. Siyasi, iqtisadi və mədəni sahədə baş verən yeniliklərdən faydalanan Avropa dövlətləri Şərq ölkələrinə nisbətən daha böyük nailiyyətlərə imza atırlar. Ümid edirik ki, 8-ci sinif Ümumi tarix kursunda öyrəndikləriniz bilik və bacarıqlarınızın zənginləşməsinə kömək edəcəkdir.

Bu şərəfli yolda sizə uğurlar arzulayırıq!

1

# QIZILBAŞ DÖVLƏTLƏRİ

Şah I Abbas, Xosrov xan, Əfşar dövləti

*Qızılbaşlar Səfəvilər dövlətində hakim mövqe tuturdular. Səfəvilər dövlətinin həm də "Qızılbaşlar dövləti" adlandırılması bununla əlaqədar idi. Qızılbaşlar əvvəlcə Şamlı, Rumlu, Ustaclı, Təkəli, Əfşar, Qacar, Zülqədər, Varsaq, Qaradağlı (Qaradağ sufiləri), sonralar isə Bayat, Qaramanlı, Baharlı, Alpaut, Ərəşli, Qazaxlı, Borçalı və başqa türk tayfalarını birləşdirirdi.*



**Səfəvi dövləti.** Qızılbaşlığı dövlət ideologiyası səviyyəsinə yüksəltmiş Səfəvilər dövləti, Şah I Abbasın (1587–1629) keçirtdiyi islahatlar nəticəsində XVII yüzilliyin əvvəllərində yenidən gücləndi.

Səfəvilərin şərq torpaqlarını işğaldan azad edən Şah I Abbas Osmanlı ilə bağlanmış müqaviləyə sadiq qalaraq qərb qonşusu ilə xoş münasibətlər saxlamağa çalışırdı.



*Şah I Abbas*




Şah Abbasın Osmanlı sultanı III Murada yazdığı məktubda deyilirdi: "İslam qoşunu (Osmanlı ordusu nəzərdə tutulur) kafirlərlə döyüşə getdiyi üçün bizim aramızda olan məhəbbət və birlik elə möhkəmlənmişdir ki, heç bir ixtilafımız yoxdur... Əgər siz əmr etsəniz, ölkələrimiz arasındakı sərhədlərdə dayanan qızılbaş əmirlərini və qoşunlarını dinsiz kafirləri dəf etmək üçün göndərə bilərəm ki, biz də kafirlərlə döyüşmək savabından bəhrəmənd (bəhrələnmiş) olaq və düşmənlər bizim ittifaqımızı eşidib ... məhv olsunlar".




Verilənlər əsasında Şah I Abbasın fəaliyyətini qiymətləndirin.

Osmanlıda hakimiyyət dəyişikliyindən sonra taxta çıxan yeni sultan Şah I Abbasa yazdığı məktubla səfəviləri müharibəyə təhrik etdi.

Bu müharibə zamanı Səfəvi qoşunları Osmanlı tərəfindən işğal olunmuş ərazilərini azad etdi.



III Muraddan sonra Osmanlı taxtına çıxan III Mehmet özünün baş çavuşunu Səfəvi sarayına göndərmiş və Səfəvi vəliəhdinin İstanbula göndərilməsini tələb etmişdi. Şah I Abbas elçiyə "Səfəvi qaydalarına görə ölkənin əsil sahibi vəliəhd sayılır və şah özü də onun təbəəsi hesab edilir" – deyə cavab vermiş və "sultana hörmət əlaməti olaraq özüm onun sarayına gedərəm", – demişdi. Elçinin bu münasibətinə dözməyən şah onun saqqalını qırxdıraraq İstanbula göndərmişdi.



Səfəvi dövlətinin diplomatik münasibətlərini təhlil edin.

Şah I Abbas ingilis donanmasının köməyi ilə portuqaliyalıları səfəvilərin Hind okeanına mühüm çıxışı olan Hörmüzdən qovdu. Şah I Abbas Moskva çarlığı və Böyük Moğol dövlətləri ilə də dostluq əlaqələri saxlayırdı.



*Şah I Səfi*

Şah I Abbasdan sonra hakimiyyətə gəlmiş nəvəsi I Səfinin hakimiyyəti illərində (1629–1642) osmanlılarla sülh müqaviləsinin imzalanması nəticəsində əmin-amanlığın yaranması və hərbi xərclərin azlığı Səfəvi dövlətinin iqtisadi gücünü artırdı.

Ənənəvi sənətkarlıq sahələri daha da inkişaf etdi. İstər qonşu, istərsə də Qərbi Avropa dövlətləri ilə geniş ticarət əlaqələri yaradıldı. Avropa ölkələrinə ixrac olunan mallar arasında Azərbaycan ustalarının toxuduqları xalçalar xüsusi yer tuturdu.



Səfəvilərin Avropa dövlətləri ilə ticarət əlaqələri ölkənin iqtisadi inkişafına necə təsir göstərirdi?

Səfəvi hökmdarı II Abbasın dövründə (1642–1666) Moskva çarlığının təbəələri olan kazakların səfəvilərin ticarət karvanlarına hücumları iki dövlət arasındakı münasibətləri gərginləşdirdi.

1653-cü ildə Şirvan bəylərbəyi Xosrov xanın başçılıq etdiyi Səfəvi ordusu sayca bir neçə dəfə çox olan rus-kazak dəstələrini darmadağın edərək Moskva çarlarının Şimali Qafqazda inşa etdirdiyi qalaları dağıtdı.



*Şah II Abbas*



Səfəvilərin Şimali Qafqazdakı rus qalalarını dağıtmalarının səbəbini izah edin.

Şah II Abbas Həştərxan üzərinə yürüşə hazırlığa başladı. Böyük Moğol dövlətinin səfəvilərin şərq sərhədlərini pozaraq Qəndəhar şəhərini mühasirəyə alması xəbərini eşidən şah Moskva çarının sülh xahişini qəbul etdi. Tezliklə Böyük Moğol dövləti ilə münasibətlər də qaydaya salındı.

Səfəvilərin qonşularla dinc münasibətlər saxlaması Süleyman şahın hakimiyyəti illərində də (1666–1694) davam etmişdi.



***Süleyman şah***



“Şah Süleyman ədalətli və qətiyyətli hökmdar idi. O, dövlət işlərini məharətlə idarə edir, elm və şəriətə hamilik edirdi. Hər bir zümrənin hüquqlarını ciddi şəkildə qoruyan Süleyman şah qonşu hökmdarlarla da dostluq münasibətlərini saxlayırdı.
Ömrünün axırlarında şiddətli ayaq ağrısından yeddi il yataqda yatmış, hicri 1105-ci (1694) ildə vəfat etmişdir”.



Səfəvi şahları II Abbas və Süleymanı müqayisə edin.

XVII yüzilliyin sonlarında Səfəvi dövləti keçmiş qüdrətini itirməyə başladı. İqtisadi vəziyyətin get-gedə pisləşməsi ictimai həyata da təsirini göstərdi. Nəticədə ölkə əhalisi içərisində narazılıq artdı.

AVROPA ÖLKƏLƏRİNİN İQTİSADİ YÜKSƏLİŞİNİN SƏBƏBLƏRİ

- Böyük coğrafi kəşflər nəticəsində dünya ticarətinin okeanlara keçməsi
- müstəmləkələrdən qiymətli metallar, ucuz xammal və işçi qüvvəsinin gətirilməsi
- əhalinin gəlirlərinin çoxalması
- əmək bölgüsünün olduğu və yeni texniki üsulların tətbiq edildiyi manufakturaların artması



Cədvələ əsaslanaraq Səfəvi dövlətinin iqtisadi vəziyyətini təhlil edin.



İqtisadi və siyasi gücünü itirmiş Səfəvi sarayı yerli hakimlərə və mərkəzi hakimiyyətə qarşı eyni vaxtda başlamış üsyanları yatıra bilmədi.

Şamaxıdakı rus tacirlərinin qarət olunması və kömək üçün Osmanlıya müraciət etməsi hər iki dövlətin zəifləmiş səfəvilərin ərazilərinə müdaxiləsinə şərait yaratdı. 1722-ci ildə əfqanların dövlətin paytaxtı İsfahanı ələ keçirməsi vəziyyəti daha da pisləşdirdi. Səfəvi şahı Sultan Hüseyn (1694–1722) taxtdan salındı. Onun əfqan işğalçılarının əlindən qurtulan oğlu Təhmasib (1722–1732) özünü şah elan etdi. 1724-cü ildə Rusiya ilə Osmanlı arasında imzalanan İstanbul müqaviləsinə əsasən Səfəvilər dövlətinin özəyi olan Azərbaycan bölüşdürüldü. Bakının işğal edilməsi şərəfinə Peterburqda, Ərdəbilin ələ keçirilməsi münasibətilə İstanbulda atəşfəşanlıq təşkil edildi.

ASİYA ÖLKƏLƏRİNİN İQTİSADİ TƏNƏZZÜLÜNÜN SƏBƏBLƏRİ

- Böyük coğrafi kəşflər nəticəsində İpək yolunun əhəmiyyətini itirməsi
- ərazilərinin işğallara məruz qalması
- pul kəsilməsi üçün qiymətli metalların azalması
- xammal ehtiyatlarının və işçi qüvvəsinin azalması
- vergilərin artırılması
- ucuz başa gələn istehsal məhsullarının idxalı nəticəsində sənətkarlıq məhsullarına olan tələbatın azalması



*Şah Sultan Hüseyn*



XVII yüzilliyin əvvəllərində Səfəvi dövlətinin siyasi tarixinə dair cədvəl tərtib edin.

Belə çətin bir dövrdə ayrı-ayrı qızılbaş tayfa əyanları və hərbi başçılar II Təhmasibin ətrafında birləşməyə başladılar. Bu hərbi başçılardan biri Əfşar tayfasından olan Nadir xan idi. Qızılbaşların müqəddəs şəhəri sayılan Məşhədin, sonra isə İsfahanın əfqanlardan geri alınması Nadir xanın şöhrətinin artmasına səbəb oldu.



*Nadir xan əfqanlarla döyüşdə*



*Şah II Təhmasib*

Bundan narahat olan II Təhmasib Nadir xanla məsləhətləşmədən İrəvandakı Osmanlı ordusuna qarşı hərbi əməliyyatlara başladı. Uğursuzluqla üzləşən Şah II Təhmasib Nadir xan tərəfindən hakimiyyətdən uzaqlaşdırıldı. Taxta onun azyaşlı oğlu Abbas çıxarılsa da, gerçək hakimiyyət Nadir xanın əlində idi. Nadir xan Əfşar Rusiya ilə bağlanan müqavilələrə əsasən rus qoşunlarını Xəzərsahili Azərbaycan torpaqlarından çıxartdı.



Nadir xanın Azərbaycan torpaqlarını işğaldan azad etməsi nə ilə nəticələndi?

Daha sonra Azərbaycandan cənubdakı Kərkük, Qərbi Azərbaycandakı **Üçmüəzzin*** və Muradtəpə döyüşlərində Osmanlı ordularını məğlub edən Nadir xan onların da Azərbaycan ərazilərindən tamamilə çıxarılmasına nail oldu.



*Müəzzin* məscidlərdə azan, namazlarda salam və təsbeh dualarını səsləndirən şəxsdir.



*Muradtəpə döyüşü*



*Kərkük döyüşü*

**Əfşar dövləti.** Səfəvilərin keçmiş sərhədlərini bərpa edən Nadir xan 1736-cı ildə Kür və Araz çaylarının qovuşduqları Suqovuşan adlı yerdə qurultay çağırdı. 2 min nəfərə yaxın nümayəndənin iştirak etdiyi bu məclisdə Nadir səs çoxluğu ilə şah seçildi.



Nadir Səfəvilər dövlətinin şərq sərhədlərini özbəklərdən qorumaq üçün I Abbas tərəfindən Urmiya gölünün cənubundan Xorasana köçürülmüş Əfşar tayfasından idi. O, ömrü boyu türk kimliyini qoruyub saxlamış və türkman olmasından qürur duymuşdur. 1734-cü ildə Osmanlı vəziri Həkimzadəyə türkcə yazdığı məktubunda osmanlılarla türkmanların eyni kökdən olduqlarını, Səfəvi torpaqlarının alicənab Türkman xalqının irsi mülkü olmasını *(məhrusi-yi il-i cəlil-i türkman)* yazmışdı.



***Nadir şah***

Nadir şahın hakimiyyəti dövründə (1736–1747) mərkəzi hakimiyyətin gücləndirilməsi ilə yanaşı, türk-müsəlman dövlətləri arasındakı məzhəb ayrılığını aradan qaldırmaq üçün müxtəlif tədbirlər görüldü. O, səfəvilər dövründəki 12 imamın şərəfinə 12 dilimli çalma yerinə, ilk 4 xəlifənin rəmzi olan 4 künclü papaq qoyulmasına nail oldu.

Müxtəlif qoşun növləri hesabına güclü ordu yaradan Nadir şah şərqə doğru yürüşə başladı.



***Qəndəhar döyüşü***

Onun əsas məqsədi Qızılbaşların şərq hüdudunda yerləşən Qəndəhar şəhərini əfqanlardan geri almaq idi. 1738-ci ildə Qəndəhar şəhəri Əfşar dövlətinin tərkibinə qatıldı.



***Əfşar imperatorluğunun bayrağı***

*ƏFŞAR ORDUSUNUN ƏSGƏR VƏ ZABİTLƏRİ*



*Piyada tüfəngçi*



*Piyada qoşunlarının zabiti*



*Piyada qoşunlarının bayraqdarı*



*Yüngül artilleriya əsgəri*



*Yüngül artilleriya zabiti*



*Atlı qoşunların əsgəri*



*Atlı qoşunların zabiti*



*Atlı qoşunların əsgəri*

Məğlub edilən əfqanların çoxu Böyük Moğol hökmdarının yanına qaçdı. Nadir şah Moğol hökmdarından əfqan qaçqınlarını ona təhvil verməyi tələb etdi. Tələbinə rədd cavabı alan şah keçilməz sayılan Xayber keçidində, sayca ordusundan iki dəfə çox olan Moğol ordularını darmadağın edərək Karnal düzənliyinə çatdı. O, moğolların buradakı ordusunu da məhv edərək Dehliyə daxil oldu.



***Karnal döyüşü***

Moğol hökmdarı Məhəmmədlə xoş davranan Nadir şah onun başına tac qoydu.



***Nadir şahın Böyük Moğol hökmdarının başına tac qoyması***

Böyük Moğol dövlətinin xəzinəsi və məşhur "Tovuz quşu" taxtı qənimət kimi əfşarlara verildi.



***"Tovuz quşu" taxtı***

Böyük Moğol hökmdarı Hind çayından qərbdəki torpaqları Azərbaycan-Əfşar dövlətinə güzəştə getdi. Buradan Türküstan üzərinə yeriyən Nadir şah Xivə və Buxara xanlıqlarını da özündən asılı vəziyyətə salaraq Azərbaycana qayıtdı.

1743-cü ildə Nadir şah yenidən Osmanlı dövləti ilə müharibəyə başladı. Baş verən döyüşlərdə Nadir şah böyük qələbə qazandı. O, humanistlik göstərərək yaralanıb əsir düşmüş Osmanlı döyüşçülərinin Qars qalasına çəkilmələrinə imkan verdi. 1746-cı ildə Osmanlı ilə bağlanmış müqaviləyə əsasən Nəcəf şəhəri Əfşarlar dövlətinə birləşdirildi.




Nadir şah və I Abbasın fəaliyyətlərinin oxşar və fərqli cəhətləri ilə bağlı cədvəl hazırlayın.

1747-ci ildə Nadir şah sui-qəsd nəticəsində öldürüldü. Onun qurduğu dövlət daha xırda hakimliklərə

parçalandı. Böyük dövlət xadimi olan Nadir şah Makedoniyalı İskəndər və Napoleonla eyniləşdirilir, "Şərqin son fatehi" adlandırılır.

Nadir şahın ölümündən sonra hakimiyyət uğrunda Azərbaycan tayfaları olan əfşarlar, qacarlar və fars mənşəli zəndlər arasında kəskin mübarizə başladı. Şirazda möhkəmlənən Kərim xan Zənd bir çox Azərbaycan hakimlərini də hiylə ilə öz tərəfinə çəkməyə nail oldu.

Kərim xan Zənd yanında faktiki olaraq əsir kimi saxladığı Səfəvilər nəslindən olan şahzadəni III İsmayıl adı ilə "şah" elan edərək, İranın mərkəzi vilayətlərini "dövlət vəkili" adı ilə idarə edirdi. Azərbaycan hakimləri arasındakı çəkişmələrdən istifadə edən Kərim xan Zənd əvvəlcə Məhəmməd Həsən xan Qacarı, daha sonra isə urmiyalı Fətəli xan Əfşarı mübarizədən kənarlaşdıraraq Azərbaycanın cənub ərazilərinin də xeyli hissəsini ələ keçirdi.



*Kərim xan Zənd*

**T** Kərim xan Zəndin siyasi fəaliyyətini qiymətləndirin.

**M** Kərim xan Zənd özünün mənşəyindən utanmır, İranın qərbindəki Zaqros dağlarında köçəriliklə məşğul olan o qədər də tanınmayan bir qəbiləyə aid olmasından çəkinmirdi. Bahalı paltar geyinməyə meyil etmirdi. Başına yuxarısı Kəşmir parçası ilə örtülən çalma taxır, taxtda deyil, ucuz kilim üstündə otururdu.

**Qacarlar.** 1778-ci ildə Rusiya ilə aparılan danışıqlar zamanı Kərim xan Zənd Anadolunun şərqinə hücum etməyə söz versə də, qəfil ölümü buna mane oldu. Onun ölümündən sonra hakimiyyət uğrunda gedən mübarizədə Ağa Məhəmməd xan Qacar uğur qazandı.

1785-ci ildə Zəndlər üzərində qələbə qazanan Ağa Məhəmməd xan Qacar qısa bir müddət ərzində Azərbaycanın cənub xanlıqlarını və İranın xeyli hissəsini özünə  tabe etdi.

Qacarlar bölgədə siyasi hakimiyyətin türklərin əlində saxlanılmasına nail oldular. Onların da keçmiş Türkman xanədanları kimi Oğuz elinə və Oğuz boylarına maraq göstərdikləri aydın görünürdü.

Ordusunun əsas hissəsini qızılbaş türkmanlar təşkil edən Ağa Məhəmməd xan Qacar onların keçmiş qüdrətini bərpa etmək üçün 1794-cü ildə Zəndlər sülaləsinin sonuncu nümayəndəsini hakimiyyətdən uzaqlaşdırdı.

**S** Zəndlər sülaləsinin hakimiyyətinə son qoyulmasının tarixi əhəmiyyəti nədir?



***Ağa Məhəmməd xan Qacar***

Ağa Məhəmməd xan Qacar Qızılbaş Səfəvi və Əfşar dövlətlərinin tarixi sərhədlərini tam bərpa etmək üçün Cənubi Qafqaz üzərinə yürüşə başladı. 1795-ci ilin əvvəllərində İrəvanı tutan Ağa Məhəmməd xan ordusunun bir hissəsini Şuşanın mühasirəsində saxlayıb, Tiflis üzərinə hücum etdi.

Ağa Məhəmməd xan Qacarın Gürcüstandakı Rusiya valisinə yazdığı məktubda deyilirdi:

*"Zati-aliniz gözəl bilir ki, yüz illər boyu bizə tabe olmusunuz. İndi isə təəssüflə bildiririk ki, əllərindən ticarətdən başqa, heç nə gəlməyən ruslara qoşulmusunuz... Sizdən istəyimiz budur ki, ruslarla əlaqələrinizi kəsəsiniz. Əgər buna əməl etməsəniz, Gürcüstana qarşı hərbi əməliyyata başlayıb, rusların və gürcülərin qanından Kür boyda çaylar yaradacağıq...*

*Gürcüstan əyaləti Səfəvi dövlətinə tabe idi... Biz fars əyalətlərinin fəthi ilə məşğul olduğumuzdan bu bölgəyə yaxınlaşmırdıq. İndi fars əyalətlərinin çoxu bizim ixtiyarımıza keçdiyi üçün siz indi keçmişdəki kimi Gürcüstanı dövlətimizin bir hissəsi hesab edib əzəmətlə hüzurumuza çıxmalısınız. İtaətə razı olsan, Gürcüstan valisi olaraq qala bilərsən. Əgər bunu etməsən, səninlə də başqaları kimi davranılacaq".*

*Qacar ordusunun Tiflisə daxil olması*




Sizcə, Qacarın Tiflisə hücumunun əsas səbəbi nə idi?

1796-cı ildə Muğanda tacqoyma mərasimi keçirən Ağa Məhəmməd xan Qacar şah elan olundu. Qacar vaxtilə Səlcuq dövlətinin mərkəzi olmuş Reyin qalıqları yaxınlığındakı Tehran şəhərini paytaxt seçdi.

Qafqazda nüfuzdan düşən Rusiya bölgəyə ordu yeridərək Qacarlara rəsmən müharibə elan etdi. Ağa Məhəmməd şah Qacarın ordusunun əsas hissəsinin Xorasanda olmasından istifadə edən




Ağa Məhəmməd şah Qacar "Əfrasiyab soyundan olub, Çingiz şöhrətli, Səlcuq dayanıqlı, Teymur qüdrətli" adlandırılırdı. Özbək hakiminə yazdığı məktubda türk soyundan olmasını qeyd edən Ağa Məhəmməd şah Qacar "Allahın Turan, İran, Rum, Rusiya, Çin və Maçin, Xatay, Xotan və Hindistanın türk xanədanlarına bəxş etməsindən" öz razılığını bildirirdi.

QARA DƏNİZ
Dərbənd
Tiflis
XƏZƏR DƏNİZİ
Bakı
Gəncə
Təbriz
Marağa
Tehran
Məşhəd
İsfahan
Şiraz
Hörmüz
İran körfəzi
ƏRƏBİSTAN DƏNİZİ
Şəhərlər
Paytaxt
Qacarlar dövləti

rus qoşunları Azərbaycanın şimalında bəzi əraziləri ələ keçirdi. Lakin rus çariçası II Yekaterinanın ölümü və Ağa Məhəmməd şah Qacarın böyük bir ordu ilə Qafqaza yürüş xəbərini eşidən rus qoşunları tələm-tələsik Azərbaycanın şimal torpaqlarını tərk etdi.

1797-ci ildə Şuşada sui-qəsd nəticəsində öldürülən Ağa Məhəmməd şah Qacarın yerinə onun qardaşı oğlu, “Türk şahı” adlandırılan Fətəli şah Qacar taxta çıxdı.



***Qacarların bayrağı***



***Fətəli şah Qacar***

2

# BÖYÜK MOĞOL DÖVLƏTİ

Panipat, cagir, Maratx, Ost-Hind şirkəti, sipahi

*Moğollar türk idilər. "Moğol" adı onları səhvən monqol bilən avropalılar tərəfindən verilmişdir. Moğol imperiyasının hökmdarları şah, xan, xaqan və padşah titulları daşıyırdılar. Qərbdə (Avropada) isə onlar "Moğol imperatoru" olaraq bilinirdilər.*

## Hindistan XVII yüzilliyin əvvəllərində

Əkbər şahdan sonra onun varisləri imperiyanın ərazilərini daha da genişləndirib hakimiyyətlərini, demək olar ki, bütün Hindistana yaya bildi. Lakin şahın ölümündən sonra Böyük Moğol dövlətində mərkəzi hakimiyyətə tabesizlik meyilləri gücləndi. Feodal ara müharibələri, hakimiyyət uğrunda mübarizələr mərkəzi hakimiyyəti zəiflədirdi. Fasiləsiz müharibələr, aclıq və quraqlıq, dəbdəbəli sarayların tikilməsi dövlətin dağılmasını sürətləndirirdi. Siyasi dağınıqlıq və ara müharibələri sosial-iqtisadi inkişafı ləngidirdi. Belə şəraitdə mərkəzi hakimiyyətin zəifləməsi nəticəsində ölkədə yüzlərlə müstəqil hakimlər meydana gəldi. XVIII yüzillikdə dövlət dağılmağa başladı.

**İctimai-iqtisadi münasibətlər.** Böyük Moğol dövlətində imperator hakimiyyəti qeyri-məhdud idi. Dövlət torpaq fonduna daxil edilmiş ərazilər xalisə adlanırdı. Xalisədən şərti torpaq – cagir verilirdi. Cagir iqtadan fərqli olaraq, böyük əraziləri əhatə edirdi. Hər cagirdar yığdığı vergi hesabına muzdlu qoşun və döyüş filləri dəstəsi saxlamalı, müharibələr zamanı dövlətə qoşunla kömək etməli idi. Cagirdarların çoxu müsəlman idi.

Dövlətə tabe edilmiş və xərac verən hind knyazların şəxsi torpaqları zəmindarlıq adlanırdı. Sufi şeyxlərinin, müsəlman ruhanilərinin irsən keçən və vergidən azad olan torpaqları soyurqal və ya mülk adlanırdı. Müsəlman olmayan hinduslardan can vergisi alınmırdı. Onlar hakimiyyətin ən yuxarı vəzifələrinə qədər xidmətə buraxılırdılar.



***Qızıl, yaqut və digər qiymətli daşlardan hazırlanmış Moğol xəncəri və qını***

## Böyük Moğol dövlətinin dağılma səbəbləri

**İqtisadi səbəblər**

- quraqlıqlar
- məhsulsuzluq
- aclıq
- vergilərin artırılması
- dəbdəbəli sarayların, malikanələrin tikilməsi

**Siyasi səbəblər**

- mərkəzi hakimiyyətin zəifləməsi
- mərkəzi hakimiyyətə tabe olmamaq
- hakimiyyət uğrunda mübarizə
- ara müharibələri
- fasiləsiz müharibələr



Böyük Moğol dövlətinin tanınmış şahlarından olan Evrəngzib (Aurangzeb) (1658–1707) 89 il yaşamışdı. O, görkəmli şəxsiyyət idi. Hələ uşaqlıq vaxtlarından etibarən şəxsi şücaətləri, qətiyyəti və əməksevərliyi ilə seçilirdi. Evrəngzib atasının tapşırığına əsasən 16 yaşından etibarən mühüm dövlət işlərini yerinə yetirməklə taxta çıxanadək böyük hərbi, idarəetmə və diplomatik təcrübə qazandı. Onun savadı və iti ağlı müasirlərini heyran edirdi. Ərəb və fars dilində sərbəst danışan və gözəl xətlə yazmağı bacaran Evrəngzib doğma urdu dili ilə yanaşı, hindi dilini də bilirdi. Yalnız elmi və dini ədəbiyyatı oxuyan şah təsviri incəsənətə dəyər vermir, poeziyanı sevmədiyi üçün onu oxumağı vaxt itkisi hesab edirdi. Musiqiyə nifrət etdiyi üçün bu əsərlərin sarayda ifa olunmasını qadağan etmişdi.

Evrəngzib sadə həyat tərzi sürür, heç bir əyləncə ilə məşğul olmur, bütün dini qaydalara əməl edirdi. Şəxsən Quranın üzünü köçürür və ancaq bu işi ilə əldə etdiyi qazancını xərclədiyi üçün fəxr edirdi. Qalan bütün vaxtını idarəçiliyə və müharibəyə həsr edən şah hərbi səfərin bütün çətinliklərini əsgərlərlə bölüşürdü. Bütün məktubları əyanlara, əyalət hakimlərinə, hətta kiçik idarəedicilərə göndərilən göstərişləri şəxsən özü hazırlayırdı.



Mətnə əsasən Moğol şahının mənfi və müsbət xüsusiyyətlərini cədvəl şəklində təqdim edin.



*Maysor sarayı (müasir görünüşü) XVIII yüzillik*







KƏŞMİR

ƏFQAN DÖVLƏTİ

Multan

Lahor

Dehli

TİBET

Aqra

Luknou

Udaypur

Murşidabad

Əhmədabad

Kəlküttə

ƏRƏBİSTAN DƏNİZİ

Bombey

Heydərabad

BENQAL KÖRFƏZİ

Qoa

Serinqapatan

SEYLON ADASI


XVIII yüzilliyin sonunda ingilis Ost-Hind şirkətinin əraziləri


Ost-Hind şirkətindən asılı ərazilər

**S**

1. Böyük Moğol dövlətinin dağılmasını şərtləndirən amillər hansılar idi?

2. Sizcə, siyasi dağınıqlıq, ara müharibələri sosial-iqtisadi inkişafı necə ləngidə bilərdi?

**T**

Tarixdə indiyə kimi öyrəndiyiniz şərti torpaq sahibliyi formalarının cədvəlini qurun.

**Dövlətin süqutu.** XVIII yüzilliyin 30-cu illərində Hindistan ərazisində Maratx, Benqal, Heydərabad kimi iri müstəqil dövlətlər var idi. Bu dövlətlərin bir-biri ilə mübarizə aparması xarici müdaxiləni asanlaşdırırdı. 1739-cu ildə Nadir şah Moğol ordusunu məğlub edib Dehlini tutdu. Moğol dövləti Nadir şahdan asılılığı qəbul etdi. Nadir şah imperiyasının dağılmasından sonra Hindistanın şimali qərbində yeni bir müstəqil dövlət – Əfqan dövləti yarandı.

Tezliklə əfqanlar Şimali Hindistanı – Böyük Moğol dövlətinin torpaqlarını tutmağa başladılar. Bu zaman Maratx dövləti moğolların müdafiəsinə qalxdı. Uzun sürən Əfqan-Maratx müharibəsi **1761-ci ildə Panipat döyüşü** ilə bitdi. Maratxların döyüşdə məğlub olması **Böyük Moğol dövlətinin süqutunun başlanğıcı** oldu. Qələbəyə baxmayaraq, əfqanlar Hindistanda möhkəmlənə bilmədilər.

**S**

Nadir şah imperiyasının dağılmasının Böyük Moğol dövləti üçün hansı müsbət və mənfi cəhətləri oldu?

**İngilis işğalı.** Belə şəraitdə avropalılar Hindistana hərbi təzyiqi gücləndirməyə başladılar. Hindistana gələn ilk avropalılar portuqallar olsa da, sonradan bu ölkəyə hollandlar, xüsusən də fransız və ingilislər maraq göstərməyə başladı. İngiltərə Hindistanın işğalını Ost-Hind şirkətinin əli ilə həyata keçirirdi. Hind knyazlıqlarından güzəştlər qoparan Ost-Hind şirkəti Hindistanda pul zərb etmək, silahlı dəstələr (sipahilər) saxlamaq hüququ aldı. Tədricən şirkətin yerli hakimlərə siyasi təsiri gücləndi. Bu, Hindistanın gələcəkdə ingilislər tərəfindən işğal edilməsinə zəmin yaratdı.

Tezliklə Hindistanda nüfuz dairəsi uğrunda ingilis-fransız müharibəsi (1756–1763) başladı. Müharibədə qalib gələn ingilislər hind torpaqlarının tam işğalına başlayaraq 1770-ci ildə Benqaliya və Şimali Hindistanın digər torpaqlarında öz idarəçiliklərini yaratdılar. XVIII yüzilliyin sonlarında Cənubi Hindistanın Heydərabad və Maysor kimi dövlətləri də ingilislər tərəfindən ələ keçirildi.



***Hindistan zirehli geyimi, XVIII yüzillik***

3

# ÇİN

Min, Mancur, boqdıxan, özünütəcrid siyasəti

*XIV yüzilliyin ortalarında Çində monqol əsarətinə qarşı xalq hərəkatı nəticəsində ölkə yenidən azad oldu. Hakimiyyətə Min sülaləsi (1368–1644) gəldi. XVI yüzillikdə Min sülaləsinin işğalçı yürüşləri nəticəsində imperiyanın ərazisi xeyli genişləndi. Çin imperiyasının ərazisinə müasir Çinin daxili əyalətləri, habelə Mancuriya daxil idi. Koreya, Vyetnam və Tibet isə Çindən asılı vəziyyətdə idi.*

**Min sülaləsinin süqutu.** XVI–XVII yüzilliyin qovşağında Min sülaləsi tənəzzül dövrünə qədəm qoydu. İmperatorların qətiyyətsizliyindən istifadə edən saray əyanları dövlətin idarəçiliyini əllərinə almışdılar. Zəif imperator hakimiyyəti, əyalətlərdə zəngin ailələrin hökmranlığı, onları müdafiə edən saray əyanlarının güclənməsi, səmərəsiz daxili siyasət ölkənin vəziyyətini ağırlaşdırırdı. Xarici təhlükələrin artdığı şəraitdə imperiyanı aclıq bürümüşdü. Tezliklə kəndli üsyanları başladı. 1644-cü ildə üsyançılar Çinin paytaxtı Pekini tutdular. Min sülaləsinin hakimiyyətinə son qoyuldu. Var-dövlətlərini itirməkdən qorxuya düşən iri feodallar üsyanı yatırmaq üçün çjurçjenləri *(sonralar mancurlar adlandırıldı)* ölkəyə dəvət etdilər. Elə həmin ildə mancurlar Pekini üsyançılardan geri aldılar. Mancurların və Çin feodallarının birgə səyi nəticəsində üsyan yatırıldı. Tədricən mancurlar ölkənin qalan hissəsini də işğal etdilər. Çində yadelli Mancur sülaləsinin hakimiyyəti (1644–1911) başladı.

S

Min sülaləsinin süqutunun səbəbləri nə idi?



*Min döyüşçüsü*

**Mancur sülaləsi.** Mancurlar hakimiyyətə gəldikdən sonra ənənəvi Çin idarəçiliyinə toxunmadılar. Dövlətin başında mancurların Mancur sülaləsindən olan **boqdıxanlar*** dururdu. Onlar qeyri-məhdud hakimiyyətə malik idilər.



*Boqdıxan* Min və Mancur sülaləsindən olan Çin imperatorlarının daşıdığı tituldur. Monqol dilində boqd-kaan "müqəddəs hökmdar" deməkdir.

İmperator "səma oğlu" hesab olunurdu. Günəşə bənzərliyini sübut etmək üçün o, başdan-ayağa sarı geyimə bürünürdü. Ondan başqa heç kəsin öz paltarını sarı sapla tikməyə ixtiyarı yox idi. Mancurlar çinlilərdən itaətkarlıq tələb edirdilər. İtaətkarlığın simvolu Çin kişilərini ölüm qorxusu altında saxlayan hörük idi. Mancur sülaləsinin əsas hərbi dayağı "səkkiz bayraqlı qoşun" idi ki, burada da mancurlarla yanaşı, hakim sülaləyə sədaqətini sübut etmiş çinlilər də qulluq edirdilər.



Sizcə, nə üçün mancurlar Çinin əvvəlki idarəçiliyinə toxunmadılar?



*Min və Mancur imperatorlarının məqbərəsi*

**İctimai-iqtisadi münasibətlər.** Çində möhkəmlənən mancurlar tezliklə qonşu ərazilərin işğalına başladılar. XVIII yüzilliyin ortalarına kimi Cunqariya, Qaşqar, Şərqi Tibet ələ keçirildi. Koreya Çinin vassallığını qəbul etdi. Ruslar Amur ətrafına sıxışdırıldı. Bu işğalçılıq müharibələri nəticəsində XVIII yüzillikdə Çinin ərazisi iki dəfəyə yaxın böyüdü.



*Mancur imperatorunun geyimi*

Mancurlar torpağı əkib-becərmək və vergi yığımını nizama salmaq üçün aqrar islahatlar apardılar. Mancur döyüşçülərinə xəzinə torpaqlarından torpaq paylanılmasına başlanıldı. Bu torpaqları satmaq olmazdı.

Kənd icmasında nizam-intizama, əkinçiliyin inkişafına diqqət gücləndirildi. Kəndlilər tərəfindən becərilən sahibsiz torpaqlar onların irsi istifadəsinə keçirdi. Belə torpağı becərənlərdən üç il vergi alınmırdı. Əvvəlki sülalənin vaxtında qoyulmuş bəzi ağır vergi rüsumları ləğv edildi. Bütün bunların nəticəsində mancur hakimiyyətinin ilk iki yüzilliyi ərzində Çində aramsız inkişaf baş verdi. Əhalinin sayı sürətlə artdı.

XVIII yüzillikdə Çinin iri şəhərlərində ipək toxuculuğu sənayesi inkişaf etmişdi. Bu sahədə yüz minlərlə adam çalışırdı. Çini qablar istehsal edən dövlət manufakturaları fəaliyyət göstərirdi. Həmçinin çay istehsalı, duz çıxarma, gön dəri emalı, tikinti işləri, mədən sənayesi inkişaf edirdi.

**S** Mancurların keçirdiyi aqrar islahatların nəticəsi nə oldu?

**T** Mancur işğalı nəticəsində Çində baş verən ərazi dəyişikliklərini kontur xəritədə işləyin.



**Özünütəcrid siyasəti.** Çinə missionerlərin axını hələ Min sülaləsinin hakimiyyətinin sonlarında başlamışdı. Onlar Mancur sarayında ən önəmli mövqeyə malik idilər. Mancurlar Çində ağalıqlarının ilk dövründə Avropa ölkələrinin tacirlərindən və donanmalarından yardım alırdılar. Bu səbəbdən onlara müəyyən güzəştlər edirdilər. İngiltərə, Hollandiya, Fransa, Portuqaliya və Rusiya Çin bazarları uğrunda rəqabətə qoşulmuşdu.


*XVIII yüzillikdə Çində çay ticarəti*


*Yezuit astronomlar imperatorun qəbulunda*




XVIII yüzilliyin əvvəllərində Çin missionerlərin xidmətindən imtina etməyə başladı. Tədricən kilsələr bağlandı və missionerlər, eləcə də bütün xarici tacirlər ölkədən qovuldu. 1757-ci ildə Çin hökuməti avropalıların bu ölkəyə gəlmələrini qadağan etdi. Avropalılara yalnız Kanton (Quançjou) şəhər-limanı vasitəsilə ticarət etməyə icazə verildi. Özünütəcrid siyasəti yeritməklə hakimiyyətini möhkəmlətməyə çalışan hökumət Çinin inkişafını ləngidir, onu dünyanın qabaqcıl dövlətlərindən geri qoyurdu.



Sizcə, Çin hökuməti avropalıların ölkəyə gəlişini qadağan etməsə idi, nə baş verə bilərdi?



“Özünütəcrid siyasətinin Mancur dövlətinin qeyri-bərabər inkişafına təsiri” mövzusunda esse yazın.

4

# OSMANLI İMPERİYASI

durğunluq dövrü, Köprülü Mehmet paşa, geriləmə dövrü, "Lalə dövrü", "Yunan layihəsi", Yassı sülhü, III Səlimin islahatları

*Əsası oğuzların Qayı boyu tərəfindən qoyulmuş Osmanlı dövləti 1453-cü ildə Bizansın varlığına son qoyaraq onun paytaxtı Konstantinopolu fəth etmiş və bu şəhəri öz paytaxtına çevirərək İstanbul adlandırmışdı. XVI yüzillikdə hakimiyyətini üç qitəyə yayan Osmanlı dövləti XVII yüzilliyin əvvəllərində də qüdrətini qoruyub saxlaya bilmişdi.*

**Osmanlı imperiyası durğunluq dövründə.** Osmanlı imperiyası XVI yüzilliyin sonlarında geniş ərazilərə malik qüdrətli bir dövlət idi. Səfəvilərlə müharibələrdə qalib gələn osmanlılar Xəzər dənizinə qədər uzanan əraziləri tutmuşdu. Osmanlılar ticarət əlaqələrini genişləndirmək məqsədilə Volqa və Don çaylarını, həmçinin Aralıq dənizini Qırmızı dəniz və Hind okeanı ilə birləşdirəcək kanallar çəkilməsinə dair layihələri işləyib hazırlamışdı. Əvvəlki iqtisadi gücə malik olmayan Osmanlı dövləti bu layihələri gerçəkləşdirə bilmədi.

Yeni dövrün başlanğıcında Osmanlı dövləti tarixinin durğunluq, daha sonra isə geriləmə döneminə daxil oldu.

**DURĞUNLUQ VƏ GERİLƏMƏNİN SƏBƏBLƏRİ**

daxili səbəbləri:

- mərkəzi hakimiyyətin nüfuzdan düşməsi
- iqtisadiyyatın zəifləməsi
- ordu quruculuğunda nöqsanların artması
- kəndlilərin təhlükəsizliklərini təmin etmək üçün kütləvi şəkildə şəhərlərə köçməsi
- elm və təhsil sisteminin tənəzzülünün başlaması

xarici səbəbləri:

- sərhədlərini genişləndirə bilməməsi
- əhatəsində olan güclü dövlətlərlə rəqabət apara bilməməsi
- Böyük coğrafi kəşflərin nəticəsində dünya ticarət yollarının dəyişməsi
- Avropadakı inkişafla müqayisədə geridə qalması
- idarəetmə mexanizmlərini təkmilləşdirən Avropada mərkəzi hakimiyyətin güclənməsi

Mərkəzi hakimiyyətin nüfuzdan düşməsinin əsas səbəbi taxta çıxan hökmdarların səriştəsiz olması idi. Belə ki əvvəllər hökmdar olacaq şəxs vilayətlərə başçılıq edərək təcrübə qazandığı halda, indi onlar "**qəfəs üsulu**"* ilə tərbiyə olunurdu.

*"Qəfəs üsulu".* I Əhmədin (1603–1617) dövründə taxta çıxan hökmdarın qardaşlarını fiziki cəhətdən aradan qaldırması qaydası ləğv olunaraq "Qəfəs üsulu" tətbiq edilməyə başladı. Bu üsula əsasən taxta çıxacaq vəliəhd saray hərəmxanasında yaşayır və mühafizlər adlanan xüsusi dəstə tərəfindən qorunurdu.

Taxta çıxarılan azyaşlı hökmdarların analarının – validə sultanların dövlət işlərinə qarışmaları, sultanların hərbi yürüşlərdə ordunun başında olmaması, rəhbər vəzifələrə təyin olunma zamanı rüşvətin artması, sədrəzəmlərin *(baş vəzirlərin)* tez-tez dəyişdirilmələri də dövlət idarəçiliyinin zəifləməsinə səbəb olurdu. Əhalinin xeyli hissəsi ehtiyac içərisində yaşadığı halda, sarayda dəbdəbəli tədbirlərin keçirilməsi, hüquq sistemindəki özbaşınalıq xalqın dövlətə olan inamını azaldırdı.

T

"Qəfəs üsulu"nu əvvəlki sistemlə müqayisə edin.

Osmanlı iqtisadiyyatının zəifləməsinin müxtəlif səbəbləri var idi. Sultanların tez-tez dəyişdirilməsi zamanı **"cülus bəxşişləri"nin*** artırılması, sultan sarayının məsrəflərinin çoxalması kəndliləri var-yoxdan çıxardırdı. Yeni taxta çıxan sultan əvvəlki sultandan fərqlənmək üçün daha çox hədiyyələr paylamağa çalışırdı.

*Cülus bəxşişi* yeni taxta çıxan (cülus edən) sultanın istər mülki, istərsə də hərbi məmurlara payladığı hədiyyədir.

Böyük coğrafi kəşflər nəticəsində ticarət yollarının dəyişməsi, gömrük rüsumlarının azaldılması yerli istehsalçıların müflis olmasına səbəb olurdu. Nəticədə Osmanlı pulları da dəyərdən düşürdü.

S

Osmanlı pullarının dəyərdən düşməsinə səbəb nə idi?

İqtisadi durğunluq ordunun da zəifləməsinə gətirib çıxarmışdı. Digər tərəfdən əsgərlikdə olmayanlar da təminatlarını yaxşılaşdırmaq üçün Osmanlı ordusunun əsas zərbə qüvvələrindən olan "Qapıqulu ocaqları"na yazılıb imtiyazlardan faydalanırdılar. "Ocaq dövlət üçündür" əvəzinə, artıq "dövlət ocaq üçündür" şüarları irəli sürülürdü. Osmanlı ordusunda Avropadakı kimi yeniliklər tətbiq olunmur, donanma get-gedə zəifləyirdi.

Kənd əhalisi öz təhlükəsizliyini təmin etmək üçün şəhərlərə köçürdü. Nəticədə kənd təsərrüfatı mallarının istehsalı azalır və şəhərlərdə işsizlik artırdı.

Mədrəsələrdə dünyəvi biliklərə üstünlük verilməməsi, "**beşik alimliyi***" sisteminin tətbiqi elm və təhsilin geridə qalmasına səbəb olurdu.

*"Beşik alimliyi".* XVI yüzillikdən tətbiq edilən bu sistemə görə "alimin oğlu alimdir" hesab olunur, təhsillə yanaşı, bu sistemdən dövlət idarəçiliyində də istifadə olunurdu.

S

"Beşik alimliyi" sisteminin mənfi cəhətləri nədən ibarətdir?

Bu səbəblərə görə Səfəvilər, Avstriya və Rusiya kimi güclü dövlətlərlə həmsərhəd olan Osmanlı dövləti daha öz sərhədlərini genişləndirmək gücündə deyildi. Xüsusilə də Böyük coğrafi kəşflər nəticəsində zənginləşən, hərbi işdə get-gedə üstünlük qazanan və mərkəzi hakimiyyətin gücləndiyi Avropa ölkələri ilə müqayisədə Osmanlı geridə qalmağa başladı.

## *OSMANLI ORDUSUNUN DÖYÜŞÇÜLƏRİ*



***Osmanlı ordusunun piyada döyüşçüləri***







***Osmanlı ordusunun atlı döyüşçüləri***







***Osmanlı ordusunun topçu döyüşçüləri***







***Osmanlı donanmasının döyüşçüləri***

**Durğunluğu aradan qaldırmaq üçün keçirilən islahatlar.** Osmanlı dövlətindəki durğunluğun qarşısını almaq üçün XVII yüzilliyin II yarısında sədrəzəm Köprülü Mehmet paşanın başçılığı ilə islahatlar keçirildi. O, İslam alimləri arasındakı mübahisələrə son qoydu, dövlət büdcəsindəki kəsirləri aradan qaldırdı, orduda ciddi nizam-intizam yaratdı. Anadoludakı üsyanlar yatırıldı. Osmanlı ordusu Çanaqqalanı mühasirəyə almış venesiyalıları darmadağın edərək onları işğal etdikləri adalardan vurub çıxartdı.

Mehmet paşanın vəfatından sonra onun oğlu Fazil Əhməd paşa sədrəzəmlik vəzifəsinə gətirildi.



*Köprülü Fazil Əhməd paşa*



*Köprülü Mehmet paşa*

T

Köprülü Mehmet paşanın keçirdiyi islahatlara dair cədvəl tərtib edin.

Atasının yolunu davam etdirən Köprülü Fazil Əhməd paşa Avstriya üzərində bir çox parlaq qələbələr qazandı. Krit adası Osmanlı ordusu tərəfindən fəth edildi.



*Krit adası uğrunda döyüş*

**Reç Pospolita**★ və Rusiya ilə müharibələrdə Osmanlı ordusu öz üstünlüyünü bir daha sübut edə bildi. Ukrayna kazaklarının xeyli hissəsi Osmanlı dövlətinin himayəsinə alındı.



*Reç Pospolita* Polşa krallığı və Böyük Litva knyazlığının birləşməsi nəticəsində yaranmış dövlətdir.

Bundan qorxuya düşən Avstriya, Malta, Venesiya və Reç Pospolita 1684-cü ildə Roma papasının təşəbbüsü ilə Osmanlıya qarşı "Müqəddəs birlik" adlı xaçlı ittifaqı təşkil etdi. İki il sonra bu birliyə Rusiya da qoşuldu.

Çoxsaylı ordu ilə Osmanlı torpaqlarına hücum edən müttəfiqlər Osmanlını şərqdən də müharibəyə cəlb etmək üçün "Müqəddəs birliy"ə qoşulmaq təklifi ilə Səfəvi sarayına elçilər göndərdilər. Səfəvi hökmdarı Süleyman şah onlara: "Biz zor günündə qan və din qardaşlarımızı arxadan vurmayacağıq", – cavabını verdi.

XVII yüzilliyin sonlarında "Müqəddəs birlik" dövlətləri ilə müxtəlif cəbhələrdə müharibə aparan Osmanlı dövləti məğlub olaraq Avropada xeyli ərazilər itirdi.

Bununla da Osmanlı dövləti "durğunluq" dövründən "geriləmə" dövrünə qədəm qoydu.




XVII yüzilliyin II yarısında Osmanlı dövlətinin xarici siyasətinə aid cədvəli doldurun.

| Tutulan ərazilər | İtirilən ərazilər |
|---|---|
| | |

**Osmanlı dövləti geriləmə dövründə.** 1703-cü ildə taxta çıxan III Əhməd Osmanlının beynəlxalq aləmdə itirilmiş nüfuzunu bərpa etmək üçün tədbirlər görməyə başladı. Rusiyanın cənuba doğru artan təcavüzünün qarşısı alındı. Belə ki 1711-ci ildə I Pyotrun "Prut yürüşü" adlandırdığı hücum rus qoşunlarının Osmanlı ordusu tərəfindən mühasirəyə alınması və məğlub edilməsi ilə nəticələndi. I Pyotrun Osmanlı sədrəzəminin qərargahına göndərdiyi rus elçiləri barışıq imzalanmasına nail oldular.




Prut müqaviləsini Osmanlı dövləti üçün uğur hesab etmək olarmı?



*Prut savaşı*



*XVII yüzilliyin sonlarında*
*Osmanlının Avropada itirdiyi ərazilər*




**Osmanlı imperiyası XVII yüzilliyin sonlarında**




PODOLİYA VƏ BRASLAVİYA

AZOV DƏNİZİ

QARA DƏNİZ

Sofiya

Saloniki

İstanbul

Samsun

Ankara

EGEY DƏNİZİ

Afina

İzmir

Antalya

MOREYA

Bu qələbədən ruhlanan III Əhməd "Müqəddəs birliy"in digər üzvləri olan Avstriya və Venesiya ilə müharibəyə başladı. Lakin bu dövlətlərlə apardığı döyüşlərdə məğlubiyyətə uğrayan Osmanlı dövləti Balkan yarımadasında xeyli ərazilər itirdi.

Osmanlı sultanı idarəçilikdə və daxili siyasətdə Avropa ölkələrinin təcrübəsini öyrənmək məqsədilə İngiltərə, Fransa və Avstriyanın paytaxt şəhərlərinə xüsusi nümayəndə heyətləri göndərdi. Bu heyətin üzvləri Avropa ölkələrindəki ordu quruculuğu və elmi yeniliklərlə yaxından tanış oldu.

Osmanlı dövlətinin geriləməsinin qarşısını almaq məqsədilə Sədrəzəm İbrahim paşanın başçılığı ilə islahatlar keçirilməsinə başlanıldı.

Dünyəvi elmlərə maraq artdı. Osmanlıda ilk mətbəə açıldı. Qara və Mərmərə dənizlərinin xəritəsi çəkildi. Çiçək xəstəliyinə qarşı peyvənd edilməsi minlərlə insanın həyatını xilas etdi. İstanbulda yanğından mühafizə dəstəsi təşkil olundu.

Avropa memarlığı ilə tanışlıq nəticəsində İstanbulda yeni üslubda binaların inşasına başlanıldı. İbrahim paşa İstanbul xiyabanlarında lalə gülü



***İbrahim paşa***



***Sultan III Əhmədin Avropa ölkələrinin elçilərini qəbul etməsi***

üslubunda bəzədilməsinə xüsusi diqqət yetirirdi. Buna görə də İbrahim paşanın sədrəzəmlik dönəmini çox vaxt "Lalə dövrü" adlandırırlar.

İbrahim paşa Osmanlının əvvəlki nüfuzunun dirçəldilməsini Avropada itirilmiş torpaqlarının qaytarılmasında deyil, boşalmış xəzinənin doldurulmasında görürdü. Xəzinəyə qənaət etmək məqsədilə hətta bəzi yeniçəri birlikləri ləğv olundu. Lakin xəzinəyə daxil olan gəlirin çox hissəsi ordu quruculuğuna yox, daha çox tez-tez sultan sarayında Avropa elçilərinin də iştirak etdikləri dəbdəbəli əyləncələrə və ziyafətlərə xərclənirdi.

Sarayda çoxlu xərc tələb edən belə tədbirlərin keçirilməsi ölkədə narazılığın daha da artmasına səbəb oldu. İstanbul əhalisi Səfəvilərə qarşı döyüşə gedəcək ordunun başında III Əhmədin getməsini tələb etdi. Gündüz  ordunun başında guya səfəvilərə qarşı müharibəyə getdiyini  nümayiş etdirən sultanın axşam qayıqla İstanbula qayıtması əhalinin səbrini tükətdi. Bundan istifadə edən narazı yeniçərilər üsyan qaldıraraq 1730-cu ildə Sultan III Əhmədin və sədrəzəm İbrahim paşanın hakimiyyətdən uzaqlaşdırılmasına nail oldular.




"Lalə dövrü"nün başa çatmasına hansı amillər səbəb oldu?



*Üsyançıların Sultan III Əhmədin sarayına hücumu*

III Əhmədin qardaşı oğlu I Mahmud sultan elan olundu.

I Mahmud, ilk növbədə, qiyamçı yeniçərilərin müqavimətini qırdı. "Lalə dövrü"ndə inşa edilən və üsyan zamanı dağıdılmış tikililərin bir çoxunu bərpa etdirdi.



***Sultan I Mahmud***

I Mahmud "Lalə dövrü"ndən fərqli olaraq, ordu quruculuğuna xüsusi diqqət yetirirdi. O, Nadir şah Əfşarla sülh müqaviləsi imzaladıqdan sonra əsas gücünü Avstriyaya qarşı yönəltdi. Balkanlarda ağır məğlubiyyətə uğrayan Avstriya sülh istəməyə məcbur oldu. İmzalanan müqavilə əsasında Osmanlı dövləti Balkanlarda itirdiyi ərazilərin xeyli hissəsini geri qaytara bildi. Bu işdə I Mahmudun təşəbbüsü ilə dünya hərb tarixində ilk dəfə qumbara atanlardan ibarət ayrıca qoşun növünün – **"Qumbaraçılar ocağı"*nın** təşkil edilməsi böyük rol oynamışdı.



*Qumbaraçı*. "Qumbara" sözü ("xum-e para") içərisinə pul qoyulan kiçik "küp qab" deməkdir. Osmanlıda hər biri 25 nəfərdən ibarət olan 600 nəfərlik qumbaraçılardan ibarət xüsusi "Qumbaraçılar ocağı" yaradılmışdı. Bu ocağın yaranmasında İslamı qəbul etdikdən sonra Qumbaraçı Əhməd paşa adını almış fransız Bonnevalın böyük xidmətləri olmuşdur. O, Osmanlı tarixində ilk dəfə Topçu məktəbinin açılmasına nail olmuşdu. Qumbaralar əl, yaxud da minaatanlar vasitəsilə atılırdı.




Sultan III Əhmədlə I Mahmudun oxşar və fərqli cəhətlərinə aid cədvəl qurun.



***Qumbaraçı Əhməd paşa***



***Sultan I Mahmudun Avropa ölkələrinin elçilərini qəbul etməsi***

Əmisinin İstanbulda başlatdığı abadlıq işləri I Mahmudun dövründə də davam etdirildi. İstanbulda yeni kitabxanalar, həndəsənin geniş şəkildə tədris edildiyi xüsusi məktəb və kağız istehsal edən ilk müəssisə açıldı.

***Qumbaraçı Əhməd paşanın qumbaralar və onların atılması üçün düzəldiləcək minaatanlarla bağlı əlyazması***

***Kiçik Qaynarca sülhündən sonra ərazi dəyişikliyi***

Gerilәmәnin qarşısını qısa bir müddәtә almış I Mahmuddan sonra hakimiyyәtә gәlәn sultanların dövründә Osmanlı dövlәtindә yenidәn siyasi vә iqtisadi böhranlar güclәndi. Osmanlı sultanı ordusunun zәiflәdiyini bilә-bilә 1768-ci ildә Rusiyaya müharibә elan etdi. Müharibәdә mәğlub olan Osmanlı 1774-cü ildә Kiçik Qaynarca sülh müqavilәsini imzalamağa mәcbur oldu.

Qәlәbә qazanan Rusiya sonralar "Şәrq mәsәlәsi" adlanan siyasәtini "hәll etmәk" üçün geniş fәaliyyәtә başladı. Bu siyasәtin әsas mahiyyәti *Azov vә Qara dәniz sahillәrini tam işğal edәrәk bu dәnizlәrә çıxış әldә etmәk, Bosfor vә Dardanel boğazları üzәrindә nәzarәti әlә keçirmәk vә "Yunan layihәsi"ni gerçәklәşdirmәk* idi. Avstriya ilә dә razılaşdırılmış "Yunan layihәsi"nә görә İstanbul işğal edilәrәk Konstantinopol adlandırılacaq vә Rusiyanın himayәsi altında qurulacaq Bizansın paytaxtına çevrilәcәkdi. Bu layihәdә Avstriyaya isә Balkan yarımadasının qәrbindәki torpaqların verilmәsi nәzәrdә tutulurdu.




Kiçik Qaynarca sülh müqavilәsinin imzalanmasını zәruri edәn sәbәblәri müәyyәn edin.

# YUNAN LAYİHƏSİ



Rusiya hökmdarı II Yekaterina və onun saray əyanı Q.Potyomkinin hazırladıqları "Yunan layihəsi"nin əsas məqsədləri:

*Osmanlıya mənsub olan torpaqlar hesabına öz ərazilərini daha da genişləndirmək*

*"Xristianları" guya müsəlman zülmündən qorumaq və Rusiyanı dünya pravoslavlarının mərkəzi etmək*

*Şərqdə yalnız Osmanlının deyil, Böyük Britaniya və Fransanın da nüfuzuna ağır zərbə vurmaq*

T "Yunan layihəsi"ndə nəzərdə tutulan məsələləri təhlil edin.

Öz niyyətlərini gerçəkləşdirmək məqsədilə çar Rusiyası Kiçik Qaynarca müqaviləsinə əsasən "müstəqil" elan edilən Krım xanlığını 1783-cü ildə işğal edərək yerli əhaliyə divan tutdu. Minlərlə Krım türkü Osmanlı dövlətinə sığınmaq məcburiyyətində qaldı.

**Krım tatarlarının öz doğma yurdlarını tərk etməsi**



Krım xanlığının Rusiya tərəfindən işğalına etiraz olaraq Osmanlı dövləti 1787–1791-ci illərdə Rusiya ilə müharibə etdi. Müharibəyə Rusiyanın müttəfiqi olan Avstriya da qoşuldu. Avstriya ordusunu dalbadal ağır məğlubiyyətə uğradan Osmanlı dövləti Rusiya ilə döyüşlərdə uğur qazana bilmədi. Osmanlı ilə müqavilə imzalayan Avstriya müharibədən çıxdı.

Rusiya ilə döyüşlərdə məğlub olan Osmanlı dövləti Yassı sülh müqaviləsini imzaladı. Müqaviləyə əsasən Dnestr çayı Rusiya ilə Osmanlı arasında sərhəd oldu. Rusiya Qara dənizin şimal sahillərində qəti olaraq möhkəmləndi, Cənubi Qafqazda və Balkanlarda nüfuzunu daha da artırdı.

Bununla belə, Osmanlı torpaqlarının bölüşdürülməsini nəzərdə tutan "Şərq məsələsi" Avropa ölkələrinin xeyrinə həll olunmadı. Belə ki Osmanlıya məxsus Misir uğrunda İngiltərə ilə Fransa,

Buq çayı
Dnestr çayı
MOLDOVA
Yassı
Bender
Akkerman
Hacıbəy
Oçakov
Şəhərlər
Osmanlı XVIII yüzilliyin sonlarında
Rusiya
Osmanlı dövləti
Rusiyaya verilən ərazilər

Balkanlarda isə keçmişdə bir-biri ilə müttəfiq olan Avstriya və Rusiya arasında başlayan mübarizə buna imkan vermədi.

Kiçik Qaynarca və Yassı müqavilələrinin Osmanlı dövlətinə təsirini izah edin.

**Osmanlının dağılma dövrünün başlanması.** 1791-ci ildə Yassı sülhünün imzalanması Osmanlı dövlətinin dağılma dövrünün başlanğıcı hesab edilir. 1789-cu ildə taxta çıxan III Səlim Avstriya və Rusiya ilə sülh müqavilələri imzaladıqdan sonra dövləti böhrandan çıxarmaq üçün islahatlar keçirməyi qərara aldı.

Yerli tacirlərin gəlirlərini artırmaq məqsədilə ölkə daxilində onların imtiyazları artırıldı və xarici tacirlərin fəaliyyətləri məhdudlaşdırıldı.



***III Səlim***

*III Səlimin taxta çıxması*

Avropanın qabaqcıl ölkələrində daimi fəaliyyətə başlayan Osmanlı səfirlikləri orada baş verən prosesləri yaxından izləyir və sultan sarayına məlumatlar göndərirdilər.

III Səlim Osmanlının son dövrlərdə Rusiya ilə apardığı müharibələrdə məğlub olmasının əsas səbəbini ordunun yeni dövrün döyüş üsullarının tələblərinə cavab verməməsində görürdü. Sultanın verdiyi fərmanla hərbi vəzifəsini layiqincə yerinə yetirməyən hərbçilərə verilmiş timar və ziyamətlər geri alındı. Yeniçərilərə 3 aydan bir əlavə maaşlar verilməsi qadağan edildi. Avropa nümunəsində silahlanmış və təlim görən yeni hərbi hissələr yaradıldı.

Bu hissələrdə xidmət edən hərbçilərin maaşlarının ödənilməsi üçün xüsusi xəzinədarlıq təsis olundu. Yeni qumbaraçı məktəbi açıldı. Bu məktəbin nəzdində istehkamlar qurulması ilə məşğul olan hərbçilərin hazırlanılması nəzərdə tutulurdu. Orduda hərbi təlimlər keçirilməsinin sayları artırıldı.



*Sultan III Səlimin yeni tipli ordunun önündən keçməsi*

***Napoleonun Osmanlı ordusu tərəfindən məğlub edilməsini əks etdirən ingilis karikaturu***

Hərbi Mühəndislik məktəbinin fəaliyyəti daha da gücləndirildi və donanmanın dəniz döyüşlərindəki yeni texniki tələblərə uyğun qurulmasına başlanıldı. Ordu quruculuğundakı yeniliklər Misirə soxulmaq istəyən Napoleonun Əhməd paşanın başçılıq etdiyi Osmanlı ordusu tərəfindən geri oturdulmasında mühüm rol oynamışdı. Sonradan bu məğlubiyyətlə bağlı Napoleon demişdi: "Tale məni bir qocanın *(Əhməd paşa nəzərdə tutulur* – red.*)* əlində oyuncağa çevirdi".

Avropa üsulu ilə qurulmuş yeni orduya daha çox üstünlük verilməsi, bunun üçün xüsusi xəzinədarlıq təsis edilməsi yeniçəriləri narahat etməyə başladı. Bir tərəfdən yeniçərilər, digər tərəfdən mühafizəkar din xadimləri və saray əyanları xalqın yeni ordu üçün yaradılan xəzinəyə toplanan vergidən narazı olmasından istifadə edərək üsyan qaldırdılar.

III Səlimin yeniçərilərin bir qoşun növü kimi ləğv edilməsində və üsyanı yatırtmaqda qətiyyətsizlik göstərməsi onun hakimiyyətdən uzaqlaşdırılması ilə nəticələndi.



***Yeniçərilərin III Səlimin sarayına hücumu***




Sizcə, nə üçün III Səlimin islahatları uğursuzluqla nəticələndi?

5

# VOLQABOYU VƏ URAL, SİBİR, MƏRKƏZİ ASİYANIN TÜRK XALQLARI

Kuçum xan, juz, xristianlaşdırılma, Mərkəzi Asiyanın türk xanlıqları

*XVII–XVIII yüzilliklərdə çar Rusiyası öz sərhədləri ətrafında yaşayan türk xalqlarının ərazilərini işğal etdikdən sonra Volqaboyu, Ural və Sibir ərazilərində ağır müstəmləkə rejimi qurdu.*

**Volqaboyu və Ural türkləri çar Rusiyasının zülmü altında.** XVI yüzilliyin II yarısında Rusiya çarlığının şərqə və cənuba doğru təcavüzünün artması nəticəsində Qazan, Həştərxan xanlıqları və başqırdların yaşadıqları torpaqlar ruslar tərəfindən işğal olundu.

İşğal etdiyi ərazilərdə möhkəmlənmək məqsədilə çar Rusiyasının gördüyü ilk tədbir istehkamların salınması oldu. Bu istehkamlarda yerləşdirilən, yaxşı silahlandırılmış hərbi hissələrin əsas məqsədi Volqaboyu və Ural türklərinin, eləcə də qonşu xalqların hələ işğalın ilk illərindən başlanan üsyanlarını yatırtmaq idi. Bununla kifayətlənməyən çar hökuməti XVI yüzilliyin sonlarında Volqaboyu və Uraldakı məscid və mədrəsələrin dağıdılması haqqında fərman verdi. Qazan şəhəri ətrafında 50 kilometrlik məsafədəki bütün müsəlman kəndləri dağıdıldı və onların əhalisi zorla daha uzaq ərazilərə köçürüldü. Müsəlman dini idarələrinə məxsus vəqf torpaqları alınaraq rus ruhanilərinə və kəndlilərinə paylandı.

Volqaboyu və Uralın müsəlman-türk xalqlarına metal emalı ilə məşğul olmaq qadağan edilmişdi. Çar hökuməti amansız istismara məruz qoyduğu bu xalqların silahlanmasından qorxurdu.

***Qazanın ruslar tərəfindən işğalı***



"Parçala və hökm sür" siyasəti yeridən çar hökuməti Volqaboyu və Uralın müsəlman türkləri arasında xristian dinini yaymaqla onların arasındakı birliyi pozmağa çalışırdı. Müsəlman torpaq sahibkarlarının mülkləri əllərindən alınaraq xristianlığı qəbul etmiş türklərə paylanırdı. Qədim türk dini inanclarına bağlı olan çuvaşların vəziyyəti xüsusilə ağır idi. Onlar rus qalalarının inşasında haqqı ödənilməyən işlərə və 25 illik hərbi xidmətə cəlb olunurdular.

XVII yüzilliyin əvvəllərində xristianlığı qəbul etmiş türklər çar Rusiyasının xeyli hissəsini, o cümlədən Moskvanı işğal etmiş Polşa qoşunlarının qovulmasında yaxından iştirak etmişdilər. Polşalıların Moskvadan qovulmasından dərhal sonra Rusiyada çar taxtına çıxarılacaq namizədlər içərisində Qazan xanının varisləri də var idi. Romanovlar sülaləsindən çar seçilməsinə imza atmış əyanlardan bir neçəsi türk əsilli olmuşdur.



*Volqaboyu – Ural türkləri və Rusiya ordusu Moskvanın Polşa qoşunlarından azad edilməsi uğrunda döyüşdə*

*Mixail Romanovun Moskvada taxta çıxardılması*

XVII yüzilliyin əvvəllərində Rusiya çarının Volqaboyu və Ural türklərinin vergini pulla ödəmələri və məcburi qaydada rus ordusuna çağırılmaları haqqında fərmanları yerli əhali arasında narazılığa səbəb oldu. Türklərlə yanaşı, qonşu xalqların da iştirak etdikləri üsyan amansızcasına yatırıldı. Çarın verdiyi yeni fərmana görə bundan sonra yalnız xristianlığı qəbul etmiş mülkədarlar xristian təhkimli kəndlilərə sahib ola bilərdilər. Rus əhalisinin kütləvi şəkildə türk torpaqlarına köçürülməsinə başlanıldı. Onlar ən məhsuldar torpaqlarda yerləşdirilirdilər. İşğal edilmiş ərazilərdə yeni qalaların tikintisinə başlanıldı. XVII yüzilliyin 80-ci illərində verilən çar fərmanına görə xristianlığı qəbul etməkdən imtina edən türklərin mülkləri əllərindən alınmalı, azad əhali isə təhkimli kəndliyə çevrilməli idi.

Çar Rusiyasının bu siyasətinə qarşı dərhal Qazan ətrafında yaşayan müsəlman-türk əhalisi üsyana başladı. Üsyançılar sayca onlardan çox olan rus qoşunlarını darmadağın etdilər. Qorxuya düşən çar hökuməti Volqaboyu və Ural xalqlarının zorla xristianlaşdırılması haqqında verilmiş fərmanı ləğv etməyə məcbur oldu.

Rusiyada I Pyotrun hakimiyyətə gəlməsi ilə Volqaboyu və Uralın müsəlman-türk xalqlarının istismarı daha da gücləndirildi. Torpaq vergisindən başqa, hər soba borusuna, nişanlanmağa və evlənməyə, mollalardan hər kəsdikləri nikaha və ölülər üçün oxuduqları duaya, bazar və məscidə getməyə görə də vergilər alınması haqqında fərman verildi. Gözlərinin rəngi boz olanlar 6, qara olanlar isə 8 qəpik vergi ödəməli idilər. Bu fərmanı eşitmək üçün çar hökumət nümayəndələri tatar və başqırd ağsaqqallarını Ufa yaxınlığına çağırdılar. Fərmanı qəzəblə qarşılayan ağsaqqallar onu cıraraq çaya atdılar. Bundan qəzəblənən çar hökuməti narazı əhaliyə amansız divan tutdu.

Bunu eşidən əhali yenidən üsyan qaldırdı. Üsyana qalxan müsəlman-türklərə xristianlığı qəbul etmiş türklər və Həştərxandakı atıcılar da qoşuldular. Qüvvələri birləşdirən üsyançılar bir neçə dəfə nizami rus qoşunlarını darmadağın etdilər. Onlar Moskva üzərinə yeriyib I Pyotru hakimiyyətdən uzaqlaşdırmaq qərarına gəldilər. Qorxuya düşmüş I Pyotr dərhal üsyançılarla danışıqlara başlamaq haqqında əmr verdi. Müəyyən güzəştlərlə üsyançıların sayıqlığını pozan çar hökuməti XVIII yüzilliyin əvvəllərində üsyanı yatıra bildi. Milli və

*Üsyançılarla rus qoşunları arasında döyüş*



*Qazan şəhəri yaxınlığında Rusiya orduları üsyançılar arasında döyüşdə*

dini zülm daha da ağırlaşdı. Çar hökuməti XVIII yüzilliyin ortalarında təkcə Qazan quberniyasında 500-dən çox məsciddən 400-nü dağıtdırdı.

Bir tərəfdən Volqaboyuna və Urala gəlmə rusların yerləşdirilməsi, sosial-iqtisadi zülmün artması, digər tərəfdən zorla xristianlaşdırma siyasəti yerli müsəlman-türk əhalisinin öz doğma yurdlarından Rusiyanın sənayenin inkişaf etməyə başladığı Avropa hissəsindəki ərazilərə köçmələrinə səbəb olurdu. Çar hökumətinə qarşı mübarizə səngimək bilmirdi.

XVIII yüzilliyin 70-ci illərinin əvvəllərində Rusiya çarına qarşı baş vermiş üsyanda türklərlə yanaşı, digər Volqaboyu və Ural xalqları yaxından iştirak etdilər.

Üsyan yatırılsa da, Rusiya hökumət orqanları XVIII yüzilliyin sonlarında müsəlman türklərə Qazanda mədrəsələr açmağa və daşdan məscid tikməyə icazə verməyə məcbur oldu. Türk və rus zadəganlarının hüquqları eyniləşdirildi.

**Sibir türkləri çar Rusiyasının zülmü altında.** XVI yüzilliyin 60-cı illərində Sibir və Mərkəzi Asiyada hakimiyyətdə Çingiz xanın nəslindən olan Şeybanilər sülaləsi hakimiyyətə gəlmişdi. Mərkəzi Asiya Şeybaniləri ilə sıx əlaqə saxlayan Sibir xanı Kuçum xan həm öz dövlətinin ərazisində İslam dininin yayılmasına xüsusi diqqət yetirir, həm də o dövrün ən təkmilləşmiş odlu silahları ilə təchiz olunmuş rus ordusuna qarşı qəhrəmancasına müqavimət göstərirdi. XVI yüzilliyin sonlarında Sibir xanlığı Rusiya çarlığı tərəfindən işğal olundu. Sibir xanlığını tabe etdikdən sonra rus qoşunları Sibirin içərilərinə doğru irəliləməyə başladı.

*Kuçum xan*



XVII yüzilliyin 30–40-cı illərində rus qoşunları yakutların ciddi müqavimətləri ilə qarşılaşdı. Əhalinin gözünü qorxutmaq məqsədilə onlara amansız divan tutuldu. Yoluxucu xəstəliklər və ağır müstəmləkə zülmü yakutların yarısından çoxunun məhv olmasına səbəb oldu.



***Rusiya müstəmləkəçilərinin yakutlardan vergi toplaması***

XVIII yüzilliyin əvvəllərində Rusiya müstəmləkəçiləri böyük itkilər hesabına indiki Xakasiya ərazisini ələ keçirə bildilər. Yadelli əsarətinə düşmək istəməyən xakasların bir hissəsi Mərkəzi Asiyadakı soydaşlarının yanına köçüb getdi.

Sibir çar Rusiyası üçün zəngin xammal mənbəyinə çevrildi. Buraya torpaqsız kəndlilər köçürülür,



***Xakasiyanın paytaxtı Abakanda Rusiya işğalçılarına qarşı mübarizə aparmış İrənək xana qoyulmuş heykəl***

çarizmin siyasəti ilə barışmayan ziyalılar və müqavimət göstərənlər sürgün olunurdular. Volqaboyunda və Uralda olduğu kimi, burada da ağır vergilərlə yanaşı, zorla xristianlaşdırma və ruslaşdırma siyasəti yeridilirdi.

**Mərkəzi Asiyanın türk xalqları XVII–XVIII yüzilliklərdə.** XVII yüzilliyin əvvəllərində Mərkəzi Asiyanın ən güclü dövlətləri Qazax, Buxara və Xivə (Xarəzm) xanlıqları idi. Qazax xanlığının əsas əhalisi qazaxlar idi. Buxara və Xivə xanlıqlarının



## Xivə, Buxara və Kokand xanlıqları



əhalisinin əksəriyyətini isə özbəklər və türkmənlər təşkil edirdilər. Qaraqalpaqların və qırğızların öz dövlətləri olmasa da, onlar Qazax və Buxara xanlıqları ilə sıx əlaqələr saxlayırdılar.

1709-cu ildə Mərkəzi Asiyada daha bir türk dövləti – Kokand xanlığı meydana gəldi.

**Qazax xanlığı.** XVII yüzilliyin əvvəllərində Qazax xanlığı Böyük, Orta və Kiçik juzlara parçalandı. Bu, qazaxların şərq qonşuları olan Cunqar xanlığının ordularının hücumları qarşısında müqavimət gücünü zəiflətdi. XVII yüzilliyin sonlarında Böyük juzun xeyli hissəsi cunqarların işğalı altına düşdü.

XVIII yüzilliyin 20-ci illərinin əvvəllərində torpaqlarını tərk etməyə məcbur olan qazaxlar Mərkəzi Asiyanın qərb hissəsinə və Ural çayı ətrafına köçməyə məcbur oldu. 1728-ci ildə güclərini birləşdirən qazaxlar cunqarlar üzərində qələbə qazandı.

Parçalanmış vəziyyətdə olan qazaxların xeyli hissəsi sonradan Cunqar xanlığından asılı vəziyyətə düşdü. Yalnız Rusiya himayəsini qəbul edən Kiçik juzun hökmdarı Əbülxeyir xan öz hakimiyyətini qoruyub saxlaya bildi.



***Əbülxeyir xan***

***Qazaxlar cunqarlarla döyüşdə***

Cunqariyanın zəifləməsindən istifadə edən Orta juz da Rusiya təbəəliyini qəbul etdi. Böyük juzun əraziləri isə Mərkəzi Asiyanın türk xanlıqları arasında bölüşdürüldü.

Çar Rusiyasının ağır müstəmləkə zülmünə dözməyən qazaxlar dəfələrlə üsyan qaldırmışdılar. Onlardan ən güclüsü XVIII yüzilliyin 80–90-cı illərində olmuş Batır Sırım üsyanıdır. Üsyanda qazax xalqının bütün təbəqələri iştirak etsələr də, çar Rusiyası onların qüvvələrini parçalayaraq üsyanı yatırmışdır. Üsyanın yatırılmasının bir səbəbi də onun rəhbərlərinin qətiyyətsizliyi idi.



***Batır Sırım***



Qazax xanlığının parçalanmasının səbəbləri nə idi? Parçalanmanın nəticəsi nə oldu?

**Buxara və Xivə xanlıqları.** XVII yüzilliyin əvvəllərindən Buxara xanlığında hakimiyyət Həştərxanilər sülaləsinin əlində idi. Bu sülalənin nümayəndələri arasında taxt-tac uğrunda gedən mübarizə və Xivə xanlığı ilə müharibə də xanlığın gücünü sarsıdırdı.

XVII yüzilliyin II yarısında türkmən tayfalarına amansız divan tutan Xivə xanları Buxara xanlığı ərazisinə dağıdıcı yürüşlər təşkil etdilər. XVIII yüzilliyin əvvəllərində Buxara xanlığında mərkəzi hakimiyyət tamamilə zəiflədi. Daşkənd və ətrafındakı ərazilər Kokand xanlığının tabeliyinə keçdi. Bəlx də daxil olmaqla Amudərya çayının sol sahilboyu məhsuldar əraziləri Buxara xanlığından ayrıldı.

1740-cı ildə Mərkəzi Asiya Nadir şah Əfşarın yürüşlərinə məruz qaldı. Amudərya çayının sol sahilindəki torpaqları fəth edən Nadir şah ordularını **Mavərannəhrə*** yönəltdi.



*Mavərannəhr ərəb dilində "çaylar arası" deməkdir. Amudərya ilə Sırdərya çaylarının arasındakı ərazilər belə adlanırdı.*

Bəlxə daxil olan hökmdar güclü artilleriya ilə Amudərya çayının sağ sahilinə keçdi. Buxara xanı Nadir şah Əfşardan vassal asılılığını qəbul etdi. Nadir şah Məhəmməd Rəhimi Buxara xanlığına özünün səlahiyyətli nümayəndəsi təyin etdi. Buxaralılardan ibarət 10 min nəfərlik atlı qoşunu ordusunun tərkibinə qatan Nadir şah Xivə xanlığına hücum etdi. Xivə xanı məğlub olaraq əsir düşdü. Xivəni idarə etmək üçün buraya canişinini təyin edən Nadir şah onun hakimiyyətindən narazı olanları Xorasana köçürdü.

Məhəmməd Rəhim xan keçmiş xanlığın qüdrətini bərpa edərək onu əmirlik elan etdi. XVIII yüzilliyin sonlarında Buxara əmirliyi xeyli gücləndi. Bir çox vergilər ləğv edildi, rəiyyətin vəziyyətini yüngülləşdirən qanunlar verildi. Orduda xidmətə görə sabit maaş verilməsinə başlanıldı.

*Nadir şah yürüşdə*

Mərkəzi hakimiyyətin güclənməsi təsərrüfat həyatının canlanmasına gətirib çıxardı. Xorasana yürüşlər təşkil edən Buxara hökmdarı Xivə xanını məğlub edərək Mərv şəhərini ələ keçirdi.

XVIII yüzilliyin 50–70-ci illərində Xivə xanlığında baş verən daxili çəkişmələr dövləti xeyli zəiflətdi.

**Kokand xanlığı.** XVIII yüzilliyin əvvəllərində Fərqanədə Şahruh bəyin başçılığı altında müstəqil Kokand xanlığı yarandı. XVIII yüzilliyin 40-cı illərində cunqarların hücumları və Şahruh bəyin varisləri arasındakı hakimiyyət uğrunda mübarizə Kokand xanlığının zəifləməsinə səbəb oldu.

Xeyli itkilər hesabına da olsa, cunqarların hücumlarının uğurla dəf edilməsi nəticəsində Kokand xanlığının nüfuzu xeyli artdı. XVIII yüzilliyin II yarısında Daşkənd vilayətinin xeyli hissəsi dövlətin tərkibinə qatıldı. Kokand xanlığında əhalinin rifahının yaxşı olması qonşu xanlıqların ərazilərində və Şərqi Türküstanda yaşayan türklərin bu dövlətin ərazisinə köçməsinə səbəb oldu. Burada ticarət üçün hər cür şərait yaradıldığından bazarlarda ucuzluq idi.

XVIII yüzilliyin sonlarında Kokand xanlığı ilə Buxara əmirliyi arasında başlayan hərbi əməliyyatlar hər iki dövlətin iqtisadiyyatına ağır zərbə vurdu.



Çar Rusiyasının XVI–XVIII yüzilliklərdə Volqaboyu, Ural, Sibir və Mərkəzi Asiyanın türk xalqlarına qarşı yürütdüyü siyasətin səbəb və nəticələrini aşağıdakı cədvəl şəklində təqdim edin.

| ÇAR RUSİYASININ TÜRK XALQLARINA QARŞI SİYASƏTİ | | | |
|---|---|---|---|
| | Ural türkləri | Sibir türkləri | Mərkəzi Asiyanın türk xalqları |
| Səbəb | | | |
| Nəticələr | | | |

6

# QAFQAZ

Şah I Abbas, rus işğalı, Sultan Mahmud, Nadir şah, Georgiyevsk müqaviləsi, Şeyx Mənsur, Ağa Məhəmməd şah Qacar



*XVII–XVIII yüzilliklərdə Qafqaz uğrunda Səfəvilər, Osmanlı və Rusiya arasında rəqabət xeyli gücləndi. Hər iki türk dövlətinin iqtisadi cəhətdən zəifləməsindən istifadə edərək Qafqaza yiyələnmək istəyən Rusiyanın cəhdləri uğursuz oldu.*

**Səfəvilərin irsi torpaqlarını azad etməsi.** XVI yüzilliyin sonlarında Osmanlı ilə Səfəvilər arasında imzalanmış İstanbul müqaviləsinə əsasən Cənubi Qafqaz Osmanlının hakimiyyəti altına keçmişdi. Bu işğalla barışmayan Borçalı-Pəmbək və Qazax əhalisi Cənubi Qafqazda özlərinin müstəqil xanlıqlarını yaratdı.

*Şah I Abbas*




XVII yüzilliyin əvvəllərində Cənubi Qafqazdakı torpaqlarını geri qaytarmaq istəyən Səfəvilərlə Osmanlı arasında müharibə başladı. Mənbənin yazdığı kimi, *"Şah I Abbasın qeyrət və şərəfi qızılbaşların neçə illik gorxanası olan irsi Azərbaycan və Şirvan məmləkətlərinin işğal altında qalmasına"* imkan vermədi.



Verilən məlumat və şəkil əsasında Şah I Abbası dövr baxımından qiymətləndirin.

Azərbaycan cənub torpaqlarını osmanlılardan azad edən Qızılbaş ordusu hərbi əməliyyatları Araz çayından şimala keçirdi.



***Qızılbaş tüfəngçisi. XVII yüzillik***

İrəvanın mühasirəsi zamanı strateji əhəmiyyətli bu qalanın osmanlılardan azad edilməsi üçün gürcü hakimləri də qızılbaş ordusuna yardıma gəldilər. İrəvanı azad edən qızılbaş ordusu osmanlıları Qarabağ və Gəncədən də vurub çıxartdı. Bundan sonra Borçalı-Pəmbək xanlığının inzibati mərkəzi olan Ağcaqala, Dumanın (Dumanis), Lori və Tiflis qalaları azad olundu. Osmanlının təhriki ilə Cənubi Qafqaza hücum etmiş Krım xanının qoşunları Tiflisdəki qızılbaş qarnizonu tərəfindən darmadağın edildi.

Qızılbaş qoşunları indiki Gürcüstanın şərq bölgələrini – Kartli və Kaxeti də yenidən Səfəvilər dövlətinə birləşdirərək dövlətin şimal-qərbdəki sərhədlərini bərpa etdi. Bölgədə daha da möhkəmlənmək üçün bir neçə qala inşa edildi. Buraya Azərbaycan türk tayfalarından ibarət güclü hərbi qarnizonlar yerləşdirildi. Dərbənd yenidən Səfəvilərin tərkibinə qaytarıldı.

T

Səfəvilər dövlətinin şimal-qərb sərhədlərinin möhkəmləndirilməsi üçün gördükləri tədbirləri müəyyən edin.

**Rusiyanın "İver torpaqlarına əl qoymaq" təşəbbüsünün uğursuzluğu.** XVI yüzilliyin II yarısında Həştərxan xanlığını işğal edən Rusiya Qafqaza doğru irəliləməyə can atırdı. Bu məqsədlə çar Rusiyası Şimali Qafqazın mərkəzində Terek çayının sahilində və digər strateji məntəqələrdə qalalar inşa etdirirdi.

Rusiya çarının sarayına gələn gürcü rahibi ondan "**İver**★ torpaqlarına əl qoymağı" xahiş etdi. Elçi çarı inandırdı ki, rus qoşunları Qafqazın cənubuna doğru hərəkət etsələr, çoxsaylı gürcü qoşunları onları qarşılayacaqdır.



*Qədimdə indiki Gürcüstanın şərq hissəsi İberiya (İveriya və ya İver torpaqları) adlanırdı.*



***Qızılbaşların döyüş baltası***

*Rus qoşunlarının hücumu qarşısında geri çəkilən dinc əhali*

Bu vədlərə inanan rus çarının əmrilə 1604-cü ildə Həştərxandan çıxan 10 minlik qoşun Dağıstan ərazisinə hücum etdi. Bu zaman "artıq qızılbaşların xidmətinə keçən gürcü ordusu"-nun ruslara köməyə gələ bilməyəcəkləri məlum oldu. Rus qoşunları Dağıstanın ən güclü feodal hakimliyi olan Qumuq şamxallığı ərazisinə girərək qarətə başladı. Bir çox yaşayış məskənləri yandırıldı.

Qumuqlar və qonşu xalqlar Sultan Mahmudun başçılığı altında rus işğalçılarına qarşı mübarizəyə başladılar və yadelliləri məğlub etdilər.



XVII yüzilliyin əvvəllərində rusların Qafqaza hücum etməsinə hansı amillər səbəb olmuşdu?

Dağıstanda rus qoşunlarının darmadağın edilməsi müəyyən müddət çar Rusiyasını Qafqazda təcavüzkar siyasətdən əl çəkməyə məcbur etdi.



***Sultan Mahmud***

1639-cu ildə Səfəvilərlə Osmanlı arasında imzalanan sülh müqaviləsindən sonra Qafqazda yaranan əmin-amanlıq şəhərlərin abadlaşdırılmasına, təsərrüfatın inkişafına və ticarətin genişlənməsinə səbəb oldu.




Sultan Mahmudun Rusiyanın təcavüzkar siyasətinə qarşı mübarizəsinin nəticəsi necə oldu?

**"Karvanbasan quldurlar"ın cəzalandırılması.** Qafqazdakı ərazilərini geri qaytaran Səfəvi dövləti Rusiya ilə dinc qonşuluq münasibətləri və ticarət əlaqələri saxlamağa çalışırdı. Lakin 1650-ci ildə çar Rusiyasının təbəələri olan kazaklar Azərbaycandan Şimali Qafqaza gedən karvanın qarşısını kəsərək qarət etdilər. Şirvan bəylərbəyi Xosrov xan Rusiyanın Həştərxandakı valisindən quldurların cəzalandırılmasını tələb etdi. Xosrov xan, əks halda, "Həştərxanı yerlə-yeksan edəcəyi və kazakları qovacağı" ilə hədələdi. Rusiyanın Səfəvilərlə sərhəddə yeni qalalar tikmə təşşəbüsü münasibətləri daha da gərginləşdirdi. Rusiya çarı müharibəyə hazırlıq gördü və Şimali Qafqazdakı kazaklara onların yardımına göndərilən hökumət qoşunları ilə əlbir hərəkət etmək əmrini verdi.

Səfəvi şahı II Abbas da Şirvan bəylərbəyinə rusların yeni inşa etdikləri qalaları dağıtmağı, lazım gələrsə, hərbi əməliyyatları Həştərxan tutulana qədər davam etdirməyi əmr etdi. Rusiya təcavüzündən əziyyət çəkən Qumuq

*Şirvan bəylərbəyi Xosrov xan rus kazakları ilə döyüşdə*

şamxalı, Qaytaq hakimi (usmisi), noqaylar və çeçenlərin bir hissəsi də Səfəvi qoşunlarına qoşuldu. Ağır itkilər verən rus qoşunları şimala doğru çəkilməyə məcbur oldular.



Sultan Mahmudla Xosrov xanı müqayisə edin.

| | Sultan Mahmud | Xosrov xan |
|---|---|---|
| Fərqli | | |
| Oxşar | | |

Dərbənddə toplanan çoxsaylı qızılbaş ordusunun Həştərxan üzərinə səfərə hazırlaşdığını eşidən rus çarı barışıq təklif etdi. Başlanan hərbi əməliyyatlar dayandırıldı və bir müddət sonra Səfəvilərlə Rusiya çarlığı arasında sülh müqaviləsi imzalandı.

Bu məğlubiyyətdən sonra çar Rusiyası uzun müddət Qafqazda fəal hərbi əməliyyatlar apara bilmədi.



Xəritə əsasında Qafqazdakı siyasi vəziyyətlə bağlı müzakirə keçirin.

***Qafqaz XVII–XVIII yüzilliklərdə***

**I Pyotrun vədlərinin boşa çıxması.** Qafqaza hücum cəhdləri uğursuzluqla nəticələnən çar Rusiyası Şimal müharibəsində qələbə qazandıqdan sonra cənub istiqamətində təcavüzkar siyasət yürütməyə başladı. Səfəvilər dövlətinin XVIII yüzilliyin əvvəllərində baş vermiş üsyanlar nəticəsində zəifləməsi Rusiya çarı I Pyotrun Qafqazda daha fəal siyasət yürütməsinə şərait yaratdı.

I Pyotr hələ Şimal müharibəsinin gedişində Qafqaza yürüş planı hazırlatmışdı. Bu məqsədlə Xəzər dənizinin qərb və cənub sahillərinin xəritələri çəkilib, çara təqdim edilmişdi. Əfqan üsyançılarının İsfahanda Səfəvi şahı Sultan Hüseyni taxtdan salması xəbərini alan I Pyotr dərhal Qafqaza yürüşə başlamağı qərara aldı. Ümumi sayı yüz min nəfərdən çox olan Rusiya ordusu Səfəvilərin Xəzərsahili bölgələrinə hücum etdi. Öz işğalçılıq niyyətlərini pərdələmək üçün Çar I Pyotr Qafqaz xalqlarına və digər Səfəvi təbəələrinə manifestlə müraciət etdi. O bu manifestdə yürüşünün əsas məqsədinin şaha qarşı üsyan qaldıraraq, Şamaxıdakı rus tacirlərini qarət etmiş qiyamçıları cəzalandırmaq olduğunu bildirirdi. I Pyotr öz sarayında görüşdüyü gürcü və erməni keşişlərinə isə onları "Osmanlı və Səfəvi zülmündən xilas edəcəyini" bildirmişdi. Bu keşişlər çarı inandırmışdılar ki, rus qoşunları Dağıstana girər-girməz 50 minlik erməni-gürcü ordusu I Pyotra qoşulacaq.

Səfəvilərin Tiflis valisi VI Vaxtanqın çağırdığı məşvərət şurasında gürcü əyanlarının əksəriyyəti Rusiya tərəfində döyüşməkdən imtina etdi. Çoxluğun rəyini nəzərə almayan VI Vaxtanq ona tabe olan qüvvələr və erməni dəstələri ilə birlikdə Qarabağa soxuldu. Gəncə bəylərbəyinin və Səfəvilərə sadiq qalan gürcü dəstələrinin birləşmiş qüvvələri VI Vaxtanqı darmadağın edərək onu Tiflisdən qovdular.

Dağıstan istiqamətində cənuba doğru irəliləyən rus qoşunları qumuq və çeçen döyüşçüləri tərəfindən darmadağın edildilər.




I Pyotrun Xəzərsahili ərazilərə xüsusi diqqət yetirməsinin səbəbi nə idi?



*Qumuq və çeçenlərlə işğalçı rus qoşunları arasında döyüş*



*I Pyotr Dərbənd qapıları önündə*

Bu döyüşçülərə Qumuq şamxalı başçılıq edirdi. Çoxsaylı ordu və güclü artilleriyadan istifadə edən rus qoşunları dinc əhaliyə divan tutaraq bir çox yaşayış məskənlərini yandırdılar. Böyük itkilər hesabına da olsa, rus ordusu Dərbəndi tuta bildi.

Güclü tufan rus ordusunun ərzaq dolu gəmilərini batırdığından I Pyotr Dərbənddə hərbi qarnizon saxlayaraq Həştərxana qayıtdı.

Xəzərin qərb sahillərinin çar Rusiyası tərəfindən işğalı Osmanlı sarayında narazılıqla qarşılandı. Fransanın vasitəçiliyi ilə Rusiya ilə Osmanlı arasında sülh müqaviləsi imzalandı. Xəzərin qərb və cənub sahilləri boyu əraziləri əlində saxlaya bilən Rusiya Səfəvilərin Qafqazdakı digər ərazilərinin Osmanlının nüfuz dairəsinə daxil olmasını qəbul etdi.

**S**

Nə üçün Qafqazla bağlı Rusiya və Osmanlı dövlətləri arasındakı razılaşma ədalətli deyildi?

Səfəvilərə xəyanət etdiyinə görə Osmanlı tərəfindən yaxşı qarşılanmayan keçmiş Tiflis valisi VI Vaxtanq Rusiyaya qaçdı.

Peterburqda onu çox soyuq qarşıladılar. I Pyotr VI Vaxtanqı qəbul etmək belə istəmədi.

**M**

Gürcü tarixçisinin yazdığı kimi, "Rus imperatorunun şərq xristianlarına vəd etdiyi himayəçilik gürcülər üçün yaxşı nəticələnmədi. Öz maraqları naminə gürcüləri müharibəyə cəlb edən I Pyotr onları taleyin hökmünə buraxıb aldatdığı bədbəxt VI Vaxtanqa yanında sığınacaq belə vermədi".





Rusiyanın VI Vaxtanqa qarşı münasibəti nəyi sübut edir?

Rusiyanın əlinə keçmiş Xəzərsahili ərazilərdə işğal rejimi yaradıldı.

**"Şəhər bizim, halva sizin".** XVIII yüzilliyin 20-ci illərinin II yarısından başlayaraq Nadir xan Əfşarın sərkərdəlik fəaliyyəti nəticəsində Səfəvi torpaqlarının azad olunmasına başlanıldı.



***Nadir şah yürüşdə***



***VI Vaxtanq***

1732-ci ildə Səfəvilərlə Rusiya arasında imzalanmış Rəşt razılaşmasına görə rus qoşunları Xəzər dənizinin cənub sahillərindən və Kür çayına qədərki Xəzərsahili torpaqlardan çıxarıldı. İrəvan, Tiflis və Şirvanı osmanlılardan geri alan Nadir xan Əfşar 1735-ci ildə Gəncədə Rusiya ilə yeni müqavilə imzaladı. Müqaviləyə əsasən 1722-ci ilə qədərki Səfəvi-Rusiya sərhədi bərpa olundu. Nadir xan Əfşar azad etdiyi hər bir şəhərə daxil olduqdan sonra halva çaldırır və onu ehsan kimi şəhər əhalisinə payladırdı. Bu zaman Nadir xan Əfşar şəhər əhalisinə "şəhər bizim, halva sizin" sözləri ilə müraciət edirdi.

1736-cı ildə Muğan qurultayında şah elan edilən Nadir ruslardan azad edilmiş Şimali Qafqazdakı ərazilərdə də qızılbaş qarnizonları yerləşdirdi. Terek çayı qızılbaşlarla ruslar

arasında sərhəd oldu. Rusiya tərəfindən ləğv edilmiş Qumuq şamxallığı Nadir şah Əfşar tərəfindən bərpa olundu.

**T** Şah I Abbasla Nadir şah Əfşarın oxşar və fərqli cəhətlərinə aid cədvəl qurun.

**I Pyotrun varislərinin də vədlərinin puça çıxması.** Nadir şah Əfşarın sui-qəsd nəticəsində öldürülməsindən sonra Qafqazda bir çox kiçik dövlətlər yarandı. Qafqazın bu cür parçalanması ən çox Rusiya imperiyasına sərf edirdi. Qafqazla bağlı siyasətində Rusiya yenidən I Pyotr dövründəki ənənələri davam etdirməyə başladı. Onun əsas niyyəti Qafqazda Rusiya vassallığını qəbul etmiş xırda xristian dövlətləri yaratmaq və bu dövlətləri osmanlılarla qızılbaşlara qarşı qoymaq idi.

XVIII yüzilliyin ortalarında Osmanlı hələ güclü olduğundan Rusiya Qafqazda fəal hərbi əməliyyatlar aparmağa cürət etmirdi. Lakin XVIII yüzilliyin ortalarında və sonlarında Rusiyanın Osmanlı üzərində qələbələr qazanması Qafqazdakı siyasi vəziyyəti xeyli dəyişdirdi. Qara dəniz sahillərindəki strateji qalalar, Kabarda və Osetiyanın şimalı Rusiyaya ilhaq edildi. Rusiyanın öz istehkam xətlərini Şimali Qafqazın şərqinə və cənubuna doğru genişləndirməsi nəticəsində çərkəzlərin *(adıqların)* torpaqlarının xeyli hissəsi rus işğalı altına düşdü. Ələ keçirilən Qafqaz torpaqları rus mülkədarlarına paylanırdı.

Rusiya-Osmanlı müharibəsində rus çarının tərəfində döyüşən İmereti *(Qərbi Gürcüstan)* və Kartli-Kaxet *(Şərqi Gürcüstan)* hakimlərinin "vahid Gürcüstan" yaradılması haqqında ümidləri boşa çıxdı. Osmanlı ilə Rusiya arasında bağlanmış sülh müqaviləsində "Gürcüstan" adı, ümumiyyətlə, çəkilməmişdi. Əksinə, gürcülərin birləşmələrinin qarşısını almaq məqsədilə çar Rusiyası İmeretiyanın yenidən Osmanlı asılılığında qalmasını təsdiq etdi. 1783-cü ildə isə o, Kartli-Kaxet hakimi II İrakli ilə Georgiyevsk müqaviləsini imzaladı.

**S** XVIII yüzillikdə Osmanlı və Rusiya dövlətlərinin Qafqaz uğrunda mübarizəsi nə ilə nəticələndi?



***Georgiyevsk müqaviləsinin imzalanması***

İrakli bu müqavilәni imzalamaqla Sәfәvilәr dövründә olduğu kimi, ancaq vergi vermәklә kifayәtlәnәrәk Rusiya tәrәfindәn himayә olunacağını tәmin etmәk istәyirdi. Lakin Rusiya bu müqavilәnin şәrtlәrinә Kartli-Kaxet hakiminin xarici siyasәt yeritmәk hüququnun mәhdudlaşdırılması, II İraklinin yaxın adamlarının Peterburqa girov göndәrilmәsi vә Tiflisdә rus qarnizonunun yerlәşdirilmәsi haqqında bәndlәri dә әlavә etdi. Cәmi bir neçә ildәn sonra nә Rusiya, nә dә II İrakli bu müqavilәnin şәrtlәrinә әmәl etdi.




Georgiyevsk müqavilәsi Cәnubi Qafqaz xalqlarının taleyinә necә tәsir göstәrdi?

**Qafqazı әlә keçirmәk istәyәn çar Rusiyasının növbәti uğursuzluğu.** Çar Rusiyasının Şimali Qafqazda әlә keçirdiklәri әrazilәrdә yürütdüyü müstәmlәkәçilik siyasәti yerli xalqların – noqayların, qumuqların, adıqların *(çәrkәzlәrin)*, çeçenlәrin kәskin müqavimәti ilә qarşılandı. Volqaboyunda, Uralda vә Sibirdә olduğu kimi, Rusiya hakimiyyәt orqanlarının Qafqazda da yerli әhalinin zorla xristianlaşdırması siyasәti yürütmәsi onların azadlıq mübarizәsinin İslam dini bayrağı altında aparılmasına sәbәb oldu.

1785-ci ildә Şimali Qafqazda Şeyx Mәnsurun başçılığı altında Rusiyanın müstәmlәkәçilik siyasәtinә qarşı üsyan başladı.

*Şeyx Mәnsur*



Yerli әhalinin xeyli hissәsi üsyançılara qoşuldu. Şeyx Mәnsurun **Alda döyüşündә** qazandığı qәlәbә azadlıq hәrәkatının yüksәlişinә sәbәb oldu.

*Alda döyüşü*

1787-ci ildə Rusiya ilə Osmanlı arasında başlanan müharibə dağlı xalqları daha da ruhlandırdı. Şeyx Mənsur hərbi əməliyyatları qərbə doğru genişləndirdi. Bu uğurlardan qorxuya düşən Rusiya hökuməti Şeyx Mənsura qarşı o dövrün ən müasir silahları ilə təchiz olunmuş ordu dəstələri göndərdi.

1790-cı ildə Kuban çayı sahilində Şeyx Mənsurun döyüşçüləri ilə ruslar arasında qanlı toqquşma baş verdi. Əsasən, dağlıq ərazilərdə vuruşmağa öyrəşmiş üsyançılar bu döyüşdə xeyli itkilər verdilər. Şeyx Mənsur əsir düşdü və Peterburqda dustaq saxlandığı zindanda vəfat etdi. Şeyx Mənsur Şimali Qafqaz xalqlarının çar Rusiyasına qarşı uzun müddət davam etmiş azadlıq mübarizəsinin ilk qəhrəmanlarından olmuş, hətta çar generalları da onun igidliyindən heyranlıqla bəhs etmişlər.



Alda və Kuban çayı sahilindəki döyüşlərin nəticələrini müqayisə edin.

Osmanlı üzərində qazanılan qələbə Rusiyanı Qafqazın şimalında daha da möhkəmlənməyə, cənubunu da ələ keçirməyə sövq edirdi. Rusiya yenə də riyakarlıqla Qafqazda "xristian himayəçiliyi" pərdəsi altında müstəmləkəçilik siyasəti yeridirdi. Bu siyasətin gerçəkləşməsində II İraklidən və Cənubi Qafqazda özlərinə "dövlət" qurmaq istəyən ermənilərdən istifadə olunurdu.

Rusiyanın məkrli niyyətlərindən xəbərdar olan Ağa Məhəmməd xan Qacar Azərbaycanın cənubunda qızılbaşların köhnə qüdrətini bərpa edərək 1795-ci ildə şimala doğru yürüşə başladı.

Şimali Azərbaycan xanlarının bəziləri Ağa Məhəmməd xan Qacara tabe olduqlarını bildirdilər. Daha sonra Kartli-Kaxet hakimi II İrakliyə məktub yazan Ağa Məhəmməd xan Qacar bu torpaqların hələ "Şah İsmayıl dövründən qızılbaşların" olduğunu bildirərək tabe olmağı təklif etdi. II İraklinin sarayındakı rus hərbçiləri ona "qorxmamağı" bildirdilər. Qacarla döyüşdə II İraklinin hərbi dəstələri məğlub edildi. Qızılbaş ordusu Tiflisə daxil oldu.



***Qacarların ordusu yürüşdə***



***Ağa Məhəmməd xanın Tiflisə daxil olması***

Bu hadisə Rusiyanın Cənubi Qafqaza yürüşü üçün bəhanə oldu. Lakin II Yekaterinanın qəfil ölümü rus qoşunlarının tələm-tələsik Cənubi Qafqazdan çıxarılmasına səbəb oldu.

Ağa Məhəmməd xan 1796-cı ildə Muğanda şah elan edildi. Onun hakimiyyəti dövründə qızılbaşların Qafqazdakı sərhədləri bərpa olundu. Bununla da XVIII yüzilliyin sonlarında da Qafqazın Rusiya tərəfindən işğal edilməsi və çarizmin öz işğalçılıq niyyətlərini gerçəkləşdirməsi mümkün olmadı.



Ağa Məhəmməd şah Qacarın hakimiyyətə gəlməsi Qafqazdakı siyasi vəziyyətə necə təsir etdi?



Rusiyanın Qafqaza doğru yürüşləri ilə bağlı cədvəli xronoloji baxımdan doldurun.

| *Yürüşlər* | *Nəticələri* |
|---|---|
| | |
| | |
| | |
| | |



***Qacarlar dövləti XVIII yüzilliyin sonunda***

7

# MƏDƏNİYYƏT

Mədrəsə, kitabxana, İskəndər bəy Münşi, Evliya Çələbi, mətbəə, Məhtimqulu, Tac Mahal

*XVII–XVIII yüzilliklərdə Avropadan geri qalmasına baxmayaraq, Şərq ölkələrinin mədəni həyatında müəyyən irəliləyişlər baş vermişdi. Bu yeniliklər təhsil, elm, ədəbiyyat və incəsənət sahələrində özünü göstərmişdir.*

**Təhsil.** XVII–XVIII yüzilliklərdə Səfəvi və Əfşar imperiyalarının ərazisində əsas təhsil müəssisələri yenə də məktəb və mədrəsələr idi. Ölkədə fəaliyyət göstərən bu təhsil ocaqlarının əksəriyyətinin nəzdində kitabxanalar var idi. Bununla yanaşı, alim, şair və digər kitab həvəskarlarının yaratdıqları şəxsi kitabxanalarda da qiymətli əlyazmalar saxlanılırdı. Ərdəbildə Şeyx Səfi kompleksindəki kitabxana böyük şöhrət qazanmışdı. Oradakı minlərlə nadir kitab nümunələrindən dövrün tanınmış ziyalıları da istifadə edə bilirdi.




Şeyx Səfi kitabxanasının məşhur olmasının əsas səbəblərini müəyyən edin.

Bu dövrdə Osmanlı mədrəsələrində dinlə yanaşı, dünyəvi elmlər də tədris olunurdu. Buranı bitirən məzunlar qazı, ilahiyyatçı, həkim, astronom kimi fəaliyyət göstərirdi.

*Ərdəbildə Şeyx Səfi kompleksi*



***Mədrəsədə təhsil***

Böyük Moğol imperatorlarının Hindistanda açdığı mədrəsələr dövlətin himayəsində idi. Ən məşhur mədrəsələr Aqra və Dehlidə idi. Burada ilahiyyat, riyaziyyat, astronomiya, tibb və digər elmlər tədris olunurdu.

Şimali Qafqazda da təhsil məktəb və mədrəsələrdə verilirdi. Buradakı məktəblərdə Quranın oxunması və yazı öyrədilirdi. Mədrəsələrdə isə Quranla yanaşı, məntiq, fəlsəfə, tarix, coğrafiya, hüquq və astronomiya elmləri tədris edilirdi.

Maarif sahəsində nüfuzlu din xadimləri və tanınmış alimlər çalışırdı. Dini mərkəzlərdə fəaliyyət göstərən kitabxanalar zəngin bilik mənbəyinə çevrilmişdi. Şimali Qafqaz xalqları müxtəlif əlifbalardan istifadə edirdi. Müsəlman əhali ərəb əlifbasında yazıb-oxuyurdu.

XVIII yüzillikdə avar əlifbası tərtib olundu.

Gürcüstanda açılan seminariyalar dini təhsil verən orta məktəblər idi. Belə tədris ocaqlarında, əsasən, din xadimlərinin yetişdirilməsinə xüsusi diqqət göstərilirdi.

Mərkəzi Asiyada çoxlu sayda məktəb və mədrəsələr fəaliyyət göstərirdi. Buxaradakı mədrəsə bütün müsəlman dünyasında məşhur idi.

Volqaboyu və Ural türklərinin təhsil sistemi digər türk xalqlarının təhsil sistemindən fərqlənmirdi.

Çarizmin milli müstəmləkə siyasəti – türklərin xristianlaşdırılması təhsilə mane olurdu. Əhalini xristianlaşdırmaq məqsədilə müsəlman məktəb və mədrəsələri bağlanır, xristian dini məktəbləri açılırdı. Yerli xalqların nümayəndələri yalnız rus məktəblərində və dini seminariyada təhsil almaq imkanına malik idilər.




Çarizmin türkləri xristianlaşdırmaqda məqsədi nə idi?

XVIII yüzillikdə dünyəvi məktəblər açıldı. Rusiyanın sosial-iqtisadi inkişafı bu bölgənin iqtisadiyyatını öyrənməyi tələb edirdi. Odur ki tibb, texniki və başqa peşə məktəbləri yaradıldı.

Qazanda açılan gimnaziyada təhsil rus dilində olsa da, tatar, ərəb və digər dillər də tədris olunurdu.

Rus məktəbləri Sibirdə də açılırdı. Bu məktəblərdə gəlmə rus əhalisi ilə birlikdə xristianlığı qəbul etmiş yerli əhalinin də övladları təhsil alırdı.

Bu dövrdə ilk tatar əlifbası tərtib edildi və Kiril qrafikası əsasında çuvaş əlifbası yaradıldı.



Şimali Qafqaz və Volqaboyu türklərinin təhsil sistemini müqayisə edin.

| | Şimali Qafqaz | Volqaboyu |
|---|---|---|
| Fərqli | | |
| Oxşar | | |

**Elm.** Səfəvi imperiyasının ərazisində müxtəlif elm sahələri inkişaf edirdi. Onların içərisində tarix xüsusilə seçilirdi.

Dövrün məşhur tarixçilərindən biri **İskəndər bəy Münşi** idi. Şah I Abbasın saray tarixçisi olmuş

*Qazan gimnaziyası*



*İrəvan qalasının alınması. "Dünyanı bəzəyən Abbasın tarixi" əsərindən*

Münşi özünün "Dünyanı bəzəyən Abbasın tarixi" adlı əsərində dövrün ictimai, siyasi və mədəni həyatına aid qiymətli məlumatlar vermişdir.

Nadir şahın müasiri olan **Məhəmməd Kazım** "Dünyanı bəzəyən Nadirin tarixi" əsərində Əfşar imperiyasının daxili vəziyyəti haqqında xeyli material vermişdir. Elə bu cəhətinə görə mütəxəssislər Məhəmməd Kazımın əsərini yüksək qiymətləndirirlər.

T

Cədvəli tamamlayın.

| | İskəndər bəy Münşi | Məhəmməd Kazım |
|---|---|---|
| Fərqli | | |
| Oxşar | | |

Bu dövrdə coğrafiya, fəlsəfə, məntiq, astronomiya, riyaziyyat və hüquqa da aid dəyərli elmi əsərlər yazılmışdı.

Osmanlı dövlətinin iqtisadi cəhətdən zəifləməsi təhsil sisteminə də təsirsiz ötüşmədi. Vəqf müəssisələrinin çətinliklə üzləşməsi dini elmlərin inkişafına da mənfi təsir göstərdi. Bunun əksinə olaraq dünyəvi elmlər inkişaf edirdi. Dövrün mədəniyyətinə öz töhfələrini vermiş böyük türk alimləri yetişmişdi. Katib Çələbi və Evliya Çələbi belə alimlərdən idi.

Katib Çələbi tarix, din, hüquq, siyasət, ədəbiyyat, coğrafiya və maliyyə məsələlərinə aid bir çox dəyərli əsərlərin müəllifidir. Onun əsərləri bir çox Avropa ölkələrində nəşr edilmiş və müxtəlif dillərə tərcümə olunmuşdur. Evliya Çələbinin oncildlik "Səyahətnamə" əsəri isə Osmanlı, habelə dünya tarixini və mədəniyyətini öyrənmək üçün əhəmiyyətli mənbələrdən biridir. Bu əsərdə müəllif Azərbaycan və onun şəhərləri, xüsusilə Təbriz şəhəri haqqında qiymətli məlumatlar vermişdir.



***Katib Çələbi***



***Evliya Çələbi***



Sizcə, Evliya Çələbinin Təbriz şəhərinə xüsusi diqqət ayırmasının səbəbi nədir?

Osmanlı dövlətində Avropa təcrübəsinin öyrənilməsi nəticəsində 1727-ci ildə ilk mətbəə yaradıldı. Mətbəənin dəzgah və qəlibləri xaricdən gətirilmişdi. Burada ilk çap edilmiş kitab ərəbcə-türkcə lüğət olmuşdur. Min ədəd çap olunmuş bu kitabın əl ilə yazılmış nüsxəsi 350 quruş *(xırda pul vahidi)* olduğu halda, mətbəədə çap olunan nüsxənin qiyməti cəmi 35 quruş idi.



***Osmanlı mətbəəsində çap olunan ilk kitab***



Mətbəələrin yaradılmasının hansı əhəmiyyəti oldu?

Avropa dövlətləri ilə əlaqələrin yaradılması Hindistan mədəniyyətinə təsirsiz ötüşmədi. 1784-cü ildə Uilyam Cons "Benqal-Asiya cəmiyyəti" təşkil etdi. Sonralar bu cəmiyyət "Kral cəmiyyəti" adlandırıldı. Qərbin Hindistanın zəngin qədim mədəniyyəti ilə tanış olmasında həmin cəmiyyət müsbət rol oynamışdı.



"Benqal-Asiya cəmiyyəti"nin açılmasının əhəmiyyətini izah edin.



***Uilyam Cons***

Bu dövrdə Çində ensiklopediya və lüğətlər tərtib edilmişdi. Ölkədə Çin dili ilə yanaşı, rəsmi dövlət dili olan mancur dilində də əsərlər yazılırdı.

Qafqazda tibb elminin inkişafında böyük nailiyyətlər əldə olunmuşdu. Təbiblər müxtəlif xəstəlikləri müalicə edir, çiçək xəstəliyinə qarşı peyvənd etməyi bacarırdılar. Avropalı alimlər bu xəstəliyə qarşı peyvənd üsulunu çox sonralar öyrənmişdilər.

Kartli çarı VI Vaxtanqın təşəbbüsü ilə Gürcüstanda mətbəənin əsası qoyulmuşdu. Bu mətbəədə böyük gürcü şairi Şota Rustavelinin "Pələng dərisi geymiş pəhləvan" əsəri daşbasma üsulu ilə çap olunmuşdu.

**Ədəbiyyat.** XVII–XVIII yüzilliklərdə Azərbaycanda Arif Təbrizli, Xəstə Qasım, Molla Vəli Vidadi və bir çox başqa şairlər yaşayıb-yaratmışdılar. Dövrün ən məşhur şairi isə Molla Pənah Vaqif olmuşdur.



Azərbaycan xalq şeirinin inkişafında Molla Pənah Vaqifin hansı rolu olmuşdur?


*Nəbi*


*Nədim*


*Fitnat xanım*

Osmanlı dövlətində yaşamış məşhur şairlərdən Nəbi, Nədim və Fitnat xanımın türk ədəbiyyatının inkişafında böyük xidmətləri vardır.

Çoxdilli hind poeziyasında sadə xalqın arzu və ümidləri, feodallara qarşı mübarizəsi təsvir olunurdu. Çin ədəbiyyatı tərəqqi dövrünə qədəm qoymuşdu. Ölkədə ədəbiyyat külliyyatları nəşr olunmuş, Çin klassik romanının inkişafında yeni mərhələ açılmışdı.

Qafqaz xalqları içərisində şifahi xalq ədəbiyyatı daha çox inkişaf etmişdi. Tarixi qəhrəmanlıq motivlərinin əsas yer tutduğu hekayə və rəvayətlər daha çox idi. Şah I Abbasın Gürcüstana, Nadir şahın Dağıstana yürüşlərinə dair mahnılar və rəvayətlər qoşulmuşdu.

Türkmən poeziyasının zirvəsində duran Məhtimqulu Fəraqinin ədəbi yaradıcılığı xalq ədəbiyyatı və musiqi ilə sıx bağlı idi. O, çoxlu ərəb-fars sözləri işlədilən kitab dilindən imtina etmiş, sadə xalq dilində gözəl lirik əsərlər yaratmışdı.




Sizcə, dünya mədəniyyətinin inkişafında şairlərin rolu nədən ibarət olmuşdur?




Sadə xalq dilində əsərlərin yazılmasının tarixi əhəmiyyətini izah edin.


*Vidadi və Vaqifin heykəli*


*Məhtimqulu Fəraqi*



Məhtimqulu Fəraqi yalnız türkmən xalqının deyil, türk-oğuz xalqlarının ən görkəmli şairlərindən biri olmuşdur. Həmişə xalqın içində olan, onun qəmini-kədərini, sevincini ürəyində yaşadan şair türkmənlərə birləşməyə, azadlığa, müstəqilliyə çağıran əsərləri ilə müraciət etmiş, ədəbiyyata vətənpərvərlik mövzusunu gətirmişdir. O, türkmən ədəbiyyatını milli çərçivədən çıxarıb Şərq və dünya ədəbiyyatına məxsus yeni forma və mövzularla zənginləşdirmiş, onu dünya ədəbiyyatının ümumi axarına daxil etmişdir. Şair özündən sonrakı türkmən ədəbiyyatına güclü təsir göstərmişdir. Onun əsərləri sadə xalq dilində yazılması, mümkün qədər ərəb, fars, çağatay söz və ifadələrindən təmizlənməsi ilə diqqəti cəlb edir.

Məhtimqulu Fəraqi 1724-cü ildə Türkmənistanın Gürgən şəhəri ətrafında yerləşən Hacı Qovşan kəndində anadan olmuşdur. Məhtimqulu ilk ibtidai təhsilini doğma kəndində atasından almış, sonralar Buxara və Xivədəki mədrəsələrdə təhsilini davam etdirmişdir. Məhtimqulunun mənsub olduğu sufi təriqəti vətənpərvərliyi, müstəqillik və azadlıq uğrunda mübarizəni təbliğ edirdi. Şairin əsərlərini ətraflı araşdıran tədqiqatçılar onun Azərbaycanı və şəhərlərini yaxşı tanıdığı, vətənimizdə qonaq olduğu qənaətinə gəlmişlər. "Bu dünya" adlı məşhur şeirində o, Azərbaycanın adını "Xəzirbeycan" kimi təqdim edir. Şeirləri əsasında müəyyən etmək olur ki, o, Azərbaycanda səfərdə olmuş, onun bir çox yerlərini gəzmiş, gözəl təbiətini, qonaqpərvər insanlarını əsərlərində vəsf etmişdir.

"Yaylaxları var" adlı şeirində şair Azərbaycanın dilbər guşələrindən olan Nuxanın (indiki Şəkinin) timsalında ölkəmizə qardaşlıq münasibətini ifadə etmişdir:

Səfər edib getsək Nuxa mülkünə,  
Könül istəyən tək yaylaxları var.  
Seyran etsək qönçəsinə, gülünə,  
Bağçasında bülbül oylaxları var.



Sizcə, Məhtimqulunun Azərbaycana olan sevgisi nədən irəli gəlirdi?

MAGTYMGULY  
1724 - 1807

*Şəki Xan sarayı (müasir görünüşü)*

**Memarlıq və incəsənət.** XVII–XVIII yüzilliklərdə iqtisadi və siyasi tənəzzül memarlığın inkişafına mənfi təsir göstərsə də, bu sahədə müəyyən irəliləyişlər də olmuşdu.

Şəkidəki xan sarayı hazırda da Azərbaycan və dünya memarlığının ən dəyərli incilərindən biri hesab olunur.



*Şəki Xan sarayında həyat ağacının rəsmi*




Şəki xan sarayını möhtəşəm edən hansı xüsusiyyətləri sadalaya bilərsiniz?

Səfəvi və Əfşar imperiyaları ərazisində tətbiqi sənətkarlıq yüksək inkişaf etmişdi. Azərbaycan və İran sənətkarlarının hazırladığı gümüş məmulatlar, xalçalar, parçalar bütün dünyada məşhur idi.

Bu dövrün tanınmış rəssamı olan Məhəmməd Zaman Təbrizinin əsərlərində Şərq və Qərb rəssamlıq məktəbi ənənələri özünü göstərirdi. İtalyan rəssamlarının texnikasından bəhrələnən Məhəmməd Zaman Nizami Gəncəvinin "Xəmsə"sinə aid şəkillər çəkmişdi. Bu tablolardan biri "Bəhram Gur hind şahzadəsi ilə" adlanırdı.



*"Bahram Gur hind şahzadəsi ilə" tablosu*



*Görkəmli türk şairi Nazim Hikmət Şəki xan sarayı haqqında demişdir:*

"Əgər Azərbaycanın başqa qədim tikililəri olmasaydı, bircə Şəki Xan sarayını dünyaya göstərmək bəs edərdi".

Azərbaycan memarlığında möhtəşəm yeri olan Şəki Xan sarayı hər bir qonağını təəccübləndirən orijinal sənət əsəridir. Dünya abidələri siyahısına daxil edilmiş bu sarayın özünəməxsus inşa üslubu var.

Mənbələrə əsasən Şəki xanlarının yay sarayı olan bu bina Hüseyn xanın dövründə tikilmişdir. Hüseyn xan həm də "Müştaq" təxəllüsü ilə şeirlər yazdığına görə saray bəzi mənbələrdə "Müştaq imarəti" kimi də qeyd olunmuşdur. Şəki Xan sarayı üzü cənuba baxan ikimərtəbəli binadır. Binanın bir cərgədə yerləşən üç hissəsi bir-birindən dəhlizlə ayrılır. Mərtəbələrin quruluşu eynidir.

Bura yolu düşən hər bir şəxsi, ilk növbədə, heyrətə gətirən binanın fasadındakı şəbəkə pəncərə və qapılardır. Dünyada analoqu olmayan bu şəbəkələr çox xırda həndəsi fiqurlardan ibarətdir. Şəbəkəni yaradan ağac parçalarının aralarına müxtəlif rəngli şüşələr geydirilmişdir. Hər bir kvadratmetrdə orta hesabla 5000, mürəkkəb yerlərdə isə 14000 ağac və şüşə element vardır. Rəngli şüşələrdən düşən işıq divarlarda və döşəmədə əks olunaraq əlvan şəbəkə kölgələri yaradır. Ən maraqlısı isə odur ki, şəbəkələrin hazırlanmasında, ümumiyyətlə, binanın tikintisində nə yapışqandan, nə də mismardan istifadə edilmişdir.

Binanın daxilində həndəsi və nəbati naxışlara, quş şəkillərinə, süjetli rəsmlərə – döyüş və ov səhnələrinə daha geniş yer verilmişdir. Zövqlə işlənmiş taxçalar, güzgülü buxarılar əsil sənət nümunəsidir. Taxçalar Nizami Gəncəvinin "Yeddi gözəl", "Leyli və Məcnun" poemalarına çəkilmiş illüstrasiyalarla bəzədilmişdir. Salonun qalan sahəsi isə rəsmli, ornamentli şəbəkələrlə işlənib. Otaqların divarları ilə yanaşı, tavanını da incə naxışlar bəzəyir.

Bu gün Şəki Xan sarayı öz gözəlliyi, qədimliyi, qeyri-adi memarlıq üslubu ilə turistləri ən çox cəlb edən məkanlardan biridir. Sarayın qarşısında əkilmiş yüzillik xan çinarlar isə sanki tarixin səhifələrindən söz açır, gələnləri XVIII yüzilliyə dəvət edir.



*Sultan Əhməd məscidi (müasir görünüşü)*

XVII–XVIII yüzilliklər Osmanlı memarlığının tənəzzül dövrüdür. O, əvvəlki dövrlərlə müqayisədə zəif inkişaf edirdi. Həmin dövrdə ənənəvi memarlıq üslubu artıq Avropaya xas olan **rokoko*** və **barokko*** memarlıq üslubu ilə əvəz olunmuşdu. Bu dövr Osmanlı memarlığının şah əsəri memar Mehmet ağa tərəfindən 1609–1616-cı illərdə inşa edilmiş Sultan Əhməd məscididir.



*Rokoko* XVI–XVIII yüzilliklərdə Avropada məşhur olan bəzəkli memarlıq üslubu, *Barokko* XVII–XVIII yüzilliklərdə Avropada məşhur olan təmtəraqlı memarlıq üslubudur.




Sultan Əhməd məscidinin digər məscidlərdən fərqini müəyyən edin.

Həmin dövrdə Osmanlı rəssamları, əsasən, miniatür əsərlərə üstünlük verirdilər. Dövrün məşhur rəssamı Levni idi.

Memarlıqdan fərqli olaraq, bu dövrdə musiqi yüksək inkişaf səviyyəsinə çatmışdı. Musiqidə iki əsas cərəyan var idi:

- ali təbəqələrə və saray əhlinə xitab edilən klassik musiqi
- milli nəğmələrdən meydana gələn və geniş kütlələr tərəfindən qəbul edilən xalq musiqisi

Saray musiqisi özünün ən parlaq dövrünü yaşayırdı. Hökmdarlar və əyanlar musiqiçiləri himayə edirdilər. Sultan III Səlim tanınmış musiqişünas idi.

Hindistan memarlığının inkişafı yüksək səviyyəyə çatmışdı. Memarlıq abidələri içərisində məscidlərin xüsusi yeri vardı. Dehlidəki Cümə məscidi və digər məscidlər ən yaxşı memarlıq nümunələri sayılırdı. XVII yüzillikdə gözəl memarlıq nümunələri yaradılmışdı. Böyük Moğol hökmdarı Cahan şahın həyat yoldaşının şərəfinə ucaldılan Tac Mahal məqbərəsi Hindistanın incisi hesab edilir.



*Dehlidəki Cümə məscidi (müasir görünüşü)*



Dünyanın hər yerindən minlərlə turisti Hindistana cəlb edən möhtəşəm tikili Tac Mahal.

Tikintisinə 1631-ci ildə başlanmış bu abidə Böyük Moğol hökmdarı Cahan şah tərəfindən yoldaşı Mumtaz Mahalın xatirəsini əbədiləşdirmək üçün inşa edilmişdir. Rəvayətə görə, Cahan şah hələ 16 yaşında ikən kasıb bir qıza aşiq olaraq onunla ailə qurur. Onlar 17 il birlikdə ömür sürürlər. Mumtaz Mahal 14-cü uşağı dünyaya gətirərkən vəfat edir. Cahan şah yoldaşını itirməklə barışa bilmir, xanımının gözəlliyini, ona sevgisini təcəssüm etdirəcək məqbərə tikdirmək qərarına gəlir və bu işə ən yaxşı memarları cəlb edir. Tikinti 20 il davam edir.

Tac Mahal sevgi rəmzi olmaqla yanaşı, həm də zərgərlik incisidir. Tikili, əsasən, zümrüd, müxtəlif növ əqiq və digər dəyərli daşlar, qızıl və gümüş ilə bəzədilmişdir. Bunlardan əlavə, Tac Mahalın divarları 74 sapfir, 625 almaz, 144 rubin və 97 topaz daşları ilə bəzədilmişdir.

Ağ mərmərlə inşa edilən Tac Mahal 4 yüzillik yaşına baxmayaraq, bu gözəl memarlıq incisi ona baxanları özünə heyran edir. Türbəni gözəlləşdirən daha bir səbəb onun görünüşünün rənginin dəyişməsidir. Yağış zamanı türbə şəffaf, səhərlər günəş çıxarkən çəhrayı, gün batdıqda isə qızıl suyuna salınmış kimi olur.

1983-cü ildə Tac Mahal UNESCO-nun Dünya İrsi Siyahısına daxil edilmişdir. Əlavə olaraq, məqbərə "Dünyanın Yeni Yeddi Möcüzəsi" beynəlxalq siyahısına daxil edilmişdir.



Sizcə, verilmiş məlumatlardan hansı Tac Mahalın möhtəşəmliyini sübut edir?



Hindistanda miniatür rəssamlıq da inkişaf edirdi. Hind sənətkarlarının hazırladıqları naxışlı əşyalar, bəzəkli parçalar və metal məmulatlar göz oxşayırdı. Rəqs, musiqi ölkənin ən inkişaf etmiş sənət sahələri idi.



*XVII yüzilliyə aid hind miniatürü*

Bu dövrdə Hindistanda yeni tipli teatrın əsası qoyuldu.

Çin sənətkarları və rəssamlarının sümük və mərmərdən hazırladıqları əşyalar əsil sənət əsərləri idi. Çin rəssamları ölkədə toxunan parçalara incə naxışlar vururdular.

XVII yüzillikdə Çin memarlığında monumental binaların inşasına başlandı. Pekin sarayı, Mukdendəki (indi Şenyan) imperator mavzoleyi bu dövrdə yarandı.



*Hindli rəqqasə*



*Hind musiqi aləti*



*Qafqaz rəqsi*

Avropa ölkələrində tətbiq edilən yeni forma və üsullar Çin memarlığına ciddi təsir göstərə bilməmişdi. Çini bu təsirdən özünü təcrid siyasəti qorumuşdu.

Qafqaz xalqlarının özünəməxsus memarlıq abidələri var idi. Bu abidələr içərisində məscidlər, türbələr, pirlər, kilsələr və s. xüsusilə seçilirdi. Burada müdafiə məqsədi daşıyan qüllələr və mülki binaların inşası da geniş yayılmışdı.

Musiqi və rəqslərdə çoxəsrlik tarixi əlaqələrdən doğan ümumi cəhətlər xüsusilə çox idi. Qafqazın bütün şənliklərində ayaq barmaqları üzərində oynanılan rəqs böyük həvəslə ifa edilirdi.



Sizcə, Qafqaz rəqsləri burada yaşayan xalqların hansı xüsusiyyətlərini musiqi dili ilə təqdim edir?

8

# İNGİLTƏRƏ

Burjuaziya, puritanlar, Stüartlar, Respublika, "Uzunmüddətli parlament", "Şanlı inqilab", sənaye çevrilişi

*Digər Avropa ölkələrindən fərqli olaraq, İngiltərənin ictimai-siyasi həyatında parlament üstün idi. Parlament mütləqiyyətin möhkəmlənməsinə imkan vermədi. Parlament kral qarşıdurması nəticəsində İngiltərə parlamentli monarxiyaya çevrildi.*

**Sosial-iqtisadi vəziyyət.** XVII yüzilliyin birinci yarısında aqrar ölkə olan İngiltərənin iqtisadi inkişafı sürətlənmişdi. Kapitalist münasibətlərinin inkişafı feodalizmin böhranını dərinləşdirdi. Əmtəə-pul münasibətlərinin inkişafı nəticəsində kəndlilərin təbəqələşməsi prosesi sürətləndi, kənd burjuaziyasının və muzdlu işçilərin yaranmasına səbəb oldu.

İngiltərənin coğrafi mövqeyi, beynəlxalq ticarət yollarının üzərində yerləşməsi ölkədə iqtisadi inkişafa şərait yaratmışdı. Ada mövqeyi həm də ölkənin təhlükəsizliyinin təmin edilməsinə şərait yaradırdı. Son yüz ildə İngiltərə ərazisində müharibələr aparılmamış, əksinə, İngiltərə Avropada aparılan müharibələrdən varlanmışdı.

İngiltərədə şəhər həyatı Fransa və İspaniyaya nisbətən daha azad idi. Sexlər şəhərlərdə sənayenin inkişafına mane olsa da, kəndlərdə sex məhdudiyyətləri yox idi. Zadəganların bir qismi ticarətlə məşğul olur, sənaye müəssisələri yaradır, gəmiçiliyin inkişafına kapital qoyurdu.

**Yeni zadəganların* meydana çıxması və möhkəmlənməsi XVII yüzilliyin I yarısında İngiltərədə sosial quruluşun mühüm xüsusiyyətlərindən biri idi.**



*Yeni zadəganlar* muzdlu əmək tətbiq etməklə təsərrüfatı kapitalistcəsinə təşkil edən təbəqədir.

Şəhərlərin artması və kapitalist münasibətlərinin inkişafı daxili ticarətin genişlənməsinə şərait yaradırdı. İngiltərə burjuaziyası müstəmləkələr ələ keçirmək istəyirdi və güclü donanmanın yaradılmasında maraqlı idi.

**Mahud*** və yun istehsalının artması, Hindistandan pambığın gətirilməsi İngiltərə tacirlərinin sərvətini artırmışdı. Mahud ixracı yuna olan tələbatı artırır, bu isə qoyunçuluğun inkişafına təkan verirdi.



*Mahud* üz tərəfi keçə kimi basıq yun və ya yarımyun parçadır.

Zadəganlar kəndli torpaqlarını çəpərləmələr *(kəndli icmasına daxil olan torpaqların zorla ləğvi)* yolu ilə ələ keçirib otlaqlara çevirirdilər. Torpaqlar tədricən yeni zadəganların və manufaktura sahiblərinin əlində cəmlənirdi. Kapital yığımı və çəpərləmələr kapitalizmin inkişafına kömək edir, feodal-mütləqiyyət qaydaları isə buna mane olurdu. **Burjuaziya ilə yeni zadəganların ittifaqı inqilab ərəfəsində ölkədə sosial həyatın səciyyəvi cəhətlərindən biri idi.**



XVII yüzilliyin birinci yarısında İngiltərədə sosial quruluşun mühüm xüsusiyyətləri nə idi?

**Siyasi vəziyyət.** Kapitalizmin inkişaf etməsi İngiltərədə əhalinin feodal-mütləqiyyət qaydalarının tərəfdarlarına və əleyhdarlarına bölünməsinə səbəb oldu. İri torpaq sahiblərinin əksəriyyəti feodal-mütləqiyyət qaydalarının saxlanmasında və möhkəmlənməsində maraqlı idi. Feodal qaydalarının digər dayağı isə anqlikan kilsəsi idi.

XVII yüzilliyin birinci yarısında İngiltərə siyasi cəhətdən mütləqiyyət ölkəsi idi. Ancaq burada mütləqiyyət Fransa və Avstriyadakı qədər güclü deyildi. Krala tabe olan parlament silki orqan idi. İngiltərənin siyasi həyatına təsir edən mühüm amillərdən biri kapitalizmin inkişafı idi. Burjuaziya və yeni zadəganlar hökumətdən təkidlə onların mənafelərinin nəzərə alınmasını tələb edirdilər. Burjuaziya hökumətin istehsal və ticarət sahəsində ayrı-ayrı şəxslərə **inhisar*** hüququ satmasından narazı idi. Çünki inhisar hüququ sahibkarların bir qisminə böyük məbləğdə pula satılırdı. Bu, daxili bazarda qiymətlərin artmasına səbəb olmuşdu.



*İnhisar* hər hansı xidmətin, məhsulun istehsalı və satışına nəzarətin bir şəxsə, şirkətə və ya şirkətlər qrupuna verilməsidir.



İngiltərədə digər Avropa dövlətləri ilə müqayisədə mütləqiyyətin zəif olmasının səbəbi nə idi?

Burjuaziyanı narahat edən amillərdən biri də hökumətin **sex sənətkarlığını*** müdafiə etməsi idi. Hökumət "sex nizamnaməsi"nə əməl olunmasına ciddi şəkildə nəzarət edirdi.



*Sexlər* feodalizm cəmiyyətində şəhərlərdə iqtisadi cəhətdən müstəqil olan xırda istehsalçıların – sənətkarların peşə təşkilatlarıdır.

Sex qaydalarını pozanlardan alınan cərimələr büdcənin gəlir mənbələrindən biri idi. Hökumətin bu addımları sənaye və ticarətin inkişafına mane oldu. Mövcud vəziyyətdən narazı qalan burjuaziya və yeni zadəganlar iqtisadi imkanlarına arxalanıb məqsədlərinə çatmağı mümkün hesab edirdilər.

İngiltərənin iqtisadi və sosial-siyasi həyatındakı dəyişikliklər dini sahədə **puritançılığın*** geniş yayılması ilə müşayiət edilirdi.



*Puritanlar* ingilis protestantlarıdır. Anqlikan kilsəsinin dəbdəbəli kilsə ayinləri zamanı israfçılığa qarşı çıxan bidətçilər İngiltərədə puritan adlanırdı.

Puritanlar anqlikan kilsəsinə qarşı çıxış edirdilər. Anqlikan kilsəsinin bütün vəzifəli şəxsləri kral tərəfindən təyin edilirdi. Kilsə dövlət tərəfindən maliyyələşdirilir və əhalidən 1/10 vergisi alınırdı.

Puritanlar anqlikan kilsəsinin quruluşunu tənqid edir, bahalı ibadətlərin ləğvini tələb edirdilər. Onların ucuz kilsə tələb etməsi, qənaətcilliyi və təşəbbüskarlığı təbliğ etməsi burjuaziyanın və yeni zadəganların mənafeyinə uyğun idi.

İqtisadi inkişaf İngiltərənin Hollandiya, İspaniya və Fransa ilə rəqabətə girməsinə gətirib çıxardı. Ölkənin uğurları kapitalizmin inkişafından asılı idi. Lakin köhnə iqtisadi sistemin qalması mütərəqqi təsərrüfat formalarının inkişafını ləngidirdi. Ölkənin iqtisadi və siyasi inkişafı yolunda əsas maneə mütləqiyyət idi. **İqtisadi, siyasi və dini ziddiyyətlərin kəskinləşməsi və cərəyan edən hadisələr XVII yüzilliyin 30-cu illərinin sonunda İngiltərədə inqilabi şəraitin yaranmasını göstərirdi.**

Krala qarşı olan parlament müxalifəti açıq şəkildə sahibkarlıq fəaliyyəti üçün azadlıq tələb edirdi. 1603-cü ildə hakimiyyətə gəlmiş Stüartlar sülaləsi isə iri torpaq sahiblərinin mənafeyini müdafiə edir və kral hakimiyyətinin möhkəmlənməsinə çalışırdı. Stüartlar sülaləsinin ilk nümayəndəsi olan I Ceyms (1603–1625) hesab edirdi ki, krallar ilahi hüquqa malikdir, yəni kral hakimiyyəti Allah tərəfindən yaradılıb və bunun üçün də parlamentin hakimiyyəti ləğv edilməlidir.



I Ceyms hakimiyyətin krallara məxsus olduğunu nə ilə əsaslandırırdı?



*I Ceyms*

İngiltərə kralı parlamentin icazəsi olmadan yeni vergilər təyin edə bilməzdi. Parlamentdə müxalifətin müqaviməti ilə rastlaşan kral xəzinəni doldurmaq üçün digər yollar axtarırdı. Bunun üçün hökumət torpağa görə alınan vergiləri artırmışdı.

Stüartlar sülaləsi xarici siyasət sahəsində İspaniyaya qarşı mübarizədən imtina etmiş, I Ceymsin "nikah diplomatiyası" İngiltərənin İspaniyaya yaxınlaşmasına kömək etmişdi. Ancaq İspaniya dənizdə və müstəmləkə siyasətində hələ də İngiltərənin əsas rəqibi idi.

**Stüartlar sülaləsi puritançılığa nifrət edirdi. Çünki puritançılıq sosial-etiraz hərəkatının, eləcə də müxalifətin anqlikan kilsəsinə və mütləqiyyətə qarşı mübarizəsinin ideoloji əsasını təşkil edirdi.**



XVII yüzillikdə puritançılıq İngiltərədə hansı mübarizələrin ideoloji əsasını təşkil edirdi?

Parlamentdə və ölkədə kralla müxalifət arasında mübarizə dini formada aparılırdı. Puritanlar təqib edildiyindən ölkəni tərk edir, Hollandiyaya, Amerikaya mühacirət edirdilər. Parlament hökumət tərəfindən vətəndaşların şəxsiyyət azadlığının pozulmasına etiraz edir, İngiltərənin katolik İspaniyası və Fransa ilə yaxınlaşmasına qarşı çıxırdı.

Parlamentdə müzakirə edilən əsas məsələ ölkənin siyasi sistemində parlamentin rolu, kral hakimiyyəti ilə parlamentin səlahiyyətlərinin bölüşdürülməsi məsələsi idi. **Müxalifətin əsas məqsədi İngiltərəni parlamentli monarxiyaya çevirmək idi.**

Stüartlar sülaləsi isə mütləqiyyətin möhkəmlənməsinə və parlamentin özündən asılı olmasına çalışırdı. Buna görə də onlar bir neçə dəfə parlamenti buraxmışdılar.

**İnqilabın başlanması.** Şotlandiya ilə aparılan dini müharibələr İngiltərənin xəzinəsini xeyli boşaltmışdı. Xəzinəni doldurmaq istəyən I Çarlz 1640-cı ildə vergiləri təyin etməyə icazə almaq üçün parlamenti çağırdı. Lakin istəyinə nail ola bilmədi.

Bu parlament 1653-cü ilə qədər fəaliyyət göstərdiyindən **"Uzunmüddətli parlament"** adlanırdı. **Krala tabe olmayan parlamentin fəaliyyətə başlaması İngiltərədə inqilabın başlanmasının əyani sübutu idi.** Siyasi böhran ölkənin hər yerində çıxışlara təkan verdi. Ölkə əhalisi parlament və kral tərəfdarları olmaqla iki hissəyə bölündü. Xalq parlamenti müdafiə etdi.



I Çarlzın parlamenti yenidən çağırmaqda məqsədi nə idi?

Burjuaziya və yeni zadəganlar parlamentdə həlledici rol oynayırdı. İngiltərə əhalisi parlamentin qərarlarını bəyənir və müdafiə edirdi. Parlament ali qanunverici və icra hakimiyyətini əlində cəmləşdirmişdi. Parlament kralın yeni vergilər təyin etməsi hüququnu qadağan etmişdi. Parlamentin qərarı ilə siyasi məhbuslar azad edilmişdi. Yeni qanuna əsasən parlament kralın iradəsindən asılı olmayaraq, üç ildən bir çağırılmalı idi.



*I Çarlz*

**Vətəndaş müharibələri.** Kral parlamentin islahatları ilə barışa bilmirdi. Parlamentin bir neçə deputatının həbs olunması haqqında göstəriş verildi. Lakin xalq parlamentin müdafiəsinə qalxdığından kral deputatları həbs etdirə bilmədi. Baş verən proseslər kral və parlament arasında gərginliyi artırdı. Nəticədə kral 1642-ci ildə parlamentə müharibə elan etdi.



İngiltərədə vətəndaş müharibələrinin başlanması səbəblərini müəyyən edin.

Müharibənin əvvəli parlament üçün uğurlu olmadı. Parlament ordusu muzdlulardan və könüllülərdən ibarət idi. Nizam-intizamı zəif olan ordu hərbi təchizat baxımından da yaxşı təşkil olunmamışdı.

*İngiltərə parlamenti*

Orduya rəhbərlik edən puritanların **mötədil*** hissəsi daha çox xalqdan qorxduğu üçün kralı məğlub etməyə çalışmırdı. Kralla barışmağa meyilli olan bu qüvvələr onunla danışıqlara başladı.



*Mötədil* orta siyasi xəttin nümayəndələridir.

Puritanlar kral ordusunun buraxılmasını və kilsə islahatının keçirilməsini tələb etdilər. Lakin kral həmin tələbləri qəbul etmədi.

Əhalinin köməyi ilə müharibənin gedişində dönüş yarandı. Parlament ordusuna hərbi işi yaxşı bilən Oliver Kromvel başçılıq edirdi. O, xalqın köməyi ilə mütləqiyyəti hərbi cəhətdən məğlub etmək istəyirdi. Ona görə də Kromvel kəndlilərdən və sənətkarlardan ibarət yeni qoşun hissələri yaratmağa başladı.

1645-ci ildə **hərbi islahat haqqında qəbul olunmuş qanuna** əsasən ümumi rəhbərliyi və vahid maliyyə sistemi olan yeni tipli ordu yaradıldı. Könüllülük prinsipi əsasında təşkil olunan orduda əsgərlərin sayı qısa müddətdə 70 minə çatdı. Bu addımlar tezliklə öz bəhrəsini verdi. **Neyzbi döyüşündə parlamentin ordusu qalib gəldi.** 1646-cı ilin yayında I Çarlz Şotlandiyaya qaçdı. Lakin şotlandlar böyük məbləğdə pul alaraq onu parlamentə təslim etdilər.



Vətəndaş müharibəsində parlamentin qələbə qazanmasına səbəb olan amilləri təhlil edin.

Parlament qalib gəldikdən sonra bəzi addımlar atdı. Müzakirə edilən məsələlərdən biri aqrar məsələ ilə bağlı idi. Müharibənin başlamasından sonra parlament ruhanilərin, kralın və kral tərəfdarlarının torpaqlarının müsadirə olunması haqqında qərarlar qəbul etdi. Müsadirə edilmiş torpaqlar böyük sahələrlə satışa çıxarıldı. Bu torpaqları, əsasən, burjuaziya və ordunun zabitləri aldı. Kəndlilərin torpağa görə zadəganlardan asılılığı saxlanıldı və torpaq kəndlilərin mülkiyyətinə çevrilmədi. Torpaq məsələsi birtərəfli qaydada – burjuaziyanın və yeni zadəganların xeyrinə həll edildi. Çəpərləmələrə rəsmi şəkildə icazə verildi.



***Oliver Kromvel***



Parlament aqrar məsələni hansı formada həll etdi?

Parlamentin maliyyə siyasəti də xalqın mənafeyinə zidd idi. Borcları qaytarmaq üçün parlament əhalidən alınan vergiləri artırsa da, xarici ölkələrlə ticarət edən şirkətlərin hüquqlarına toxunmadı. Çünki parlamenti həmin şirkətlər maliyyələşdirirdi.

Kral parlamentin üstünlüyü ilə barışa bilmirdi. Buna görə də 1648-ci ildə Şotlandiyanın köməyi ilə parlamentə qarşı yeni müharibəyə başladı. Lakin bu müharibə də məğlubiyyətlə nəticələndi.

Xalqın tələbi ilə kral məhkəməyə verildi və 1649-cu ildə məhkəmənin qərarı ilə edam olundu. Kral hakimiyyəti və Lordlar palatası ləğv olundu. Kral hakimiyyətinin ləğv olunması ilə Stüartlar sülaləsinin birinci dövrü başa çatdı. Bundan sonra İngiltərə respublika elan olundu.

**Respublika.** İngiltərə respublikasını birpalatalı parlament idarə edirdi. Ali qanunverici hakimiyyət parlamentə, icra hakimiyyəti isə Dövlət Şurasına məxsus idi. Hər iki qurumda burjuaziya və yeni zadəganlar üstünlük təşkil edirdi. Respublikanın daxili və xarici siyasəti bu təbəqələrin maraqlarına xidmət edirdi.

Hökumətin həyata keçirdiyi iqtisadi tədbirlər nəticəsində burjuaziyanın və yeni zadəganların iqtisadi imkanları artdı. Ölkəyə yun və ipək parçaların gətirilməsi qadağan edildi. İngiltərəyə və onun müstəmləkələrinə məhsullar İngiltərə gəmilərində gətirilməli idi. Bu qanun Hollandiyaya qarşı yönəlmişdi. İngiltərə Hollandiyadan geri qalırdı və xarici ticarətdə onun gəmilərindən geniş istifadə edirdi. İngiltərə hökuməti ticarət-müstəmləkə rəqabətində qalib gəlmək üçün güclü donanma yaratmağa başladı.

İngiltərə respublikasının iqtisadi nailiyyətləri onun beynəlxalq nüfuzunun artmasına kömək etdi. Belə ki İspaniya və Fransa onun müstəqilliyini tanımış, Hollandiya və Portuqaliya ilə aparılan müharibədə qalib gəlmiş və onlara üstünlüyünü qəbul etdirmişdi.

Kromvel başda olmaqla İngiltərə ordusu İrlandiyada hərbi əməliyyatlar apardı. Kral tərəfdarları əhalisi katolik olan İrlandiyanın imkanlarından istifadə edirdilər. İngiltərənin məqsədi İrlandiyanı işğal etmək və orada kapitalizmin inkişafına şərait yaratmaq idi.

İrlandiyanın işğalı burjuaziyanın və yeni zadəganların daha da varlanmasına imkan yaratdı. İngiltərə ordusu tədricən inqilabi ordudan işğalçı orduya çevrildi. İngiltərə ordusu İrlandiya ilə eyni vaxtda Şotlandiyanı da tabe etdi.

XVII yüzilliyin 50-ci illərində İngiltərə əhalisi respublikaya olan inamını tamamilə itirmişdi. Respublikanın siyasəti xalqın mənafeyinə zidd idi. Ticarətin zəifləməsi və sənayedəki durğunluq işsizlərin sayının artmasına səbəb olmuş, kənd təsərrüfatı məhsullarının istehsalı azalmış və ərzaq məhsullarının qiyməti artmışdı. Ordunun saxlanılması üçün xərclər çoxalmışdı.

**Lord-protektorluq.** 1653-cü ildə ordunun rəhbərliyi ilə parlament arasında ziddiyyətlər kəskinləşdi. Uzunmüddətli parlament ölkədə tam hakimiyyətə iddia etdiyinə görə seçkiləri qeyri-müəyyən müddətə təxirə salmışdı. Ordunun rəhbərliyi isə silahlı qüvvələri möhkəmləndirməklə hakimiyyətini qorumaq niyyətində idi.

***Kromvel tərəfindən "Uzunmüddətli Parlament"in ləğv olunması***



Ölkədə ali hakimiyyət parlamentə məxsus olduğundan əhali onu baş verən hadisələrin əsas günahkarı sayırdı. Kromvel vəziyyətdən istifadə edərək "Uzunmüddətli parlament"i ləğv etdi. Kromvel və onun tərəfdarları hərbi diktaturanı yeganə etibarlı hakimiyyət forması hesab edirdi. 1653-cü ildə o, **lord-protektor*** elan edildi.



*Lord-protektor* latınca "müdafiəçi, hami" deməkdir.

Ölkədə diktatura rejimi quruldu. Real hakimiyyət hərbi diktator Kromvelə məxsus idi. O, ölkəni generalların köməyi ilə idarə edirdi. Diktator rejimi hər cür narazılıqların qarşısını amansızlıqla alırdı.

Ölkədə siyasi vəziyyət gərgin idi. Kəndlilər protektorun aqrar qanunvericiliyindən narazı idi. Onlar vergilərin tənzimlənməsini və çəpərləmələrin qadağan olunmasını tələb edirdilər. Əhali diktatura rejiminə qarşı mübarizə aparırdı.

**Stüartların bərpası.** İngiltərədə yaranmış vəziyyət hökuməti narahat edirdi. Protektorat ölkədə sosial və siyasi sabitliyi təmin edə bilmədi. Hakim dairələrin bir qismi monarxiyanın bərpasını vəziyyətdən ən yaxşı çıxış yolu hesab edirdi.

1660-cı ildə fəaliyyətə başlayan parlament özünün ilk qərarı ilə II Çarlz Stüartı İngiltərə taxtına dəvət etdi. Bununla da Stüartlar sülaləsi bərpa edildi.



Stüartlar sülaləsinin bərpa olunmasına şərait yaradan amilləri müəyyən edin.

II Çarlz bəyannamə ilə çıxış edərək bildirdi ki, inqilab iştirakçılarına bəraət veriləcək, etiqad azadlığı və inqilab dövründə ələ keçirilmiş

*Stüartların bərpası ilə bağlı toplantı*

torpaqların toxunulmazlığı təmin ediləcəkdir. Lakin kral verdiyi vədlərə əməl etmədi. 1685-ci ildə II Çarlz öldü və onun yerinə II Ceyms Stüart kral oldu. O, ölkədə katolik-mütləqiyyət rejimi yaratmaq istəyirdi. Lakin İngiltərədə daha mütləqiyyətin və katolikliyin sosial bazası yox idi.

Burjuaziyanın və yeni zadəganların mövqelərinin möhkəmlənməsi parlamentin siyasi müstəqilliyinin artmasını təmin etdi. Parlament



*II Çarlz*



*II Ceyms*

kralın mütləqiyyəti bərpa etmək cəhdləri ilə barışmaq fikrində deyildi. Katoliklik həm ingilislərə yad idi, həm də İngiltərənin əsas rəqibləri olan İspaniya və Fransada hakim idi. Torpaq sahibləri ehtiyat edirdilər ki, katolikliyin bərpası nəticəsində kilsə onların torpaqlarını geri istəyəcək. Əhalini isə dini təqiblərin bərpası ehtimalı narahat edirdi.

II Ceymsin katolikləri anqlikan kilsəsində yüksək vəzifələrə təyin etməsi **yepiskopların*** bir qisminin müxalifətin tərəfinə keçməsinə səbəb oldu. Bu addımı onu təcrid olunmuş vəziyyətə saldı.



*Yepiskop* provaslav, katolik və anqlikan kilsələrində ali dini rütbəli ruhanidir.

**"Şanlı inqilab".** Əsas siyasi qüvvələr dövlət çevrilişi həyata keçirmək qərarına gəldi. Onlar yeni vətəndaş müharibəsinin qarşısını almaq üçün hollandiyalı Oranlı Vilhelmdən ordu ilə Londona gəlib hökuməti dəyişməyi və protestantlığı qorumağı xahiş etdilər. II Ceymsin kürəkəni olan Oranlı Vilhelm protestant və Fransanın düşməni idi. O, parlamentin sərbəst fəaliyyətini təmin etməyi vəd etmişdi. Hakimiyyət dəyişikliyinin dinc yolla həyata keçməsi İngiltərə tarixində **"Şanlı inqilab"** adlanır.



*Oranlı Vilhelm*

*"Şanlı inqilab"*

1689-cu ildə İngiltərə parlamenti "**Hüquqlar haqqında bill**"* adlı qanun qəbul etdi. Qanuna əsasən İngiltərə parlamentli monarxiyaya çevrildi. Kral qanunlara veto qoymaq hüququnu itirdi və ölkəni parlamentlə birlikdə idarə etməli oldu. Bununla da İngiltərədə parlamentli monarxiya idarəetmə forması bərqərar oldu.



*Bill* anqlosaks hüquq sistemini qəbul etmiş ölkələrdə hökumətin və ya parlament üzvünün təklif etdiyi qanun layihəsidir.

1707-ci ildə İngiltərə və Şotlandiya parlamentləri birləşmiş krallıq yaratmaq barədə qərar qəbul etdi. Bundan sonra dövlət **Böyük Britaniya** adlanmağa başladı.

**İnqilabın nəticələri.** İnqilab nəticəsində İngiltərədə mütləqiyyət zəiflədi. Stüartların hakimiyyəti müvəqqəti oldu və ölkədə baş vermiş dəyişikliklərin hamısını ləğv edə bilmədi. 1688-ci ildə hakim dairələr tərəfindən çevrilişin asanlıqla həyata keçirilməsi ölkədə mütləqiyyətin zəifləməsi ilə bilavasitə bağlı idi. İnqilab nəticəsində ölkədə kapitalizmin inkişafı sürətləndi.

İnqilab və 1688-ci il çevrilişi nəticəsində burjuaziya və yeni zadəganların siyasi hakimiyyəti ələ keçirməsi, **aqrar çevrilişin*** baş verməsi, dövlətin iqtisadi və vergi siyasəti, müstəmləkə işğalları, ticarətə və sənayeyə dövlətin himayədarlığı ölkədə kapitalizmin inkişafının sürətlənməsinə səbəb oldu.



*Aqrar çevriliş* kənd təsərrüfatında muzdlu əməkdən istifadə olunması ilə bağlı kapitalist münasibətlərinə keçiddir.



"Şanlı inqilab"ın İngiltərə üçün nəticəsini müəyyən edin.

Aqrar çevriliş nəticəsində iri torpaq sahibliyi genişlənir və möhkəmlənirdi. **Lendlordlar**★ öz torpaqlarını böyük sahələrlə icarəyə verirdilər. Torpağı icarə edən isə yeni zadəganlar və burjuaziya nümayəndələri idi. Onlar öz təsərrüfatlarında muzdlu əməkdən, yeni texnikadan və səmərəli əkinçilik üsullarından istifadə edirdilər.



*Lendlordlar* kapitalist münasibətlərinin inkişafından sonra formalaşan iri torpaq mülkiyyətçiləridir.

İngiltərədə həm inqilab, həm də ilkin kapital yığımı nəticəsində sənayenin inkişafı üçün əlverişli şərait yaranmışdı. Sənaye məhsulları istehsal edən manufakturaların sayı artırdı.

Kapitalist münasibətlərinin inkişafı ölkədə daxili bazarın formalaşmasına kömək edirdi. Yeni yolların çəkilməsi və çaylardan istifadənin genişlənməsi ticarətin inkişafı üçün imkan yaradırdı.

Manufakturaların təşkilində ticarət kapitalı əsas rol oynayırdı. Xarici ticarət ölkəyə böyük mənfəət gətirirdi. İxrac coğrafiyası dəyişilmişdi. İngiltərədən Avropa ölkələrinə ixrac olunan məhsulun miqdarı azalmış, müstəmləkələrə göndərilən məhsulun miqdarı artmışdı. Qul ticarətindən İngiltərənin gəliri xüsusilə böyük idi.

Xarici ticarətdən, qul alverindən və müstəmləkələrdən əldə edilən vəsait sənayeyə sərf edilirdi. Dövlət sahibkarlara böyük məbləğdə kredit verirdi.

**İngiltərədə maarifçilik.** XVIII yüzillikdə İngiltərə üçün səciyyəvi cəhətlərdən biri maarifçilik idi. İstehsalın, ticarətin və dənizçiliyin inkişafı üçün elmi biliklərə tələbat böyük idi.

İngiltərədə maarifçilik inqilabdan sonra formalaşmışdı. Burada maarifçilik mötədil xarakter daşıyır, kilsəni və feodal qaydalarını sərt tənqid etmirdi. Onların siyasi baxışları İngiltərənin dövlət quruluşuna bəraət qazandırmağa yönəlmişdi. İngiltərədə maarifçilik

***İngiltərədə manufaktura***



ideyalarının yayılması ölkənin iqtisadi inkişafının sürətlənməsi ilə eyni dövrə təsadüf etmişdi.



İngiltərə maarifçiliyinin səciyyəvi cəhətlərini müəyyən edin.

**Sənaye çevrilişi★.** XVIII yüzilliyin ikinci yarısında İngiltərədə kapitalist münasibətlərinin inkişafı sürətləndi. Sənaye məhsullarının əksəriyyəti manufakturalarda istehsal edilirdi. Lakin ölkədə sənaye məhsuluna tələbat artmışdı.

★ *Sənaye çevrilişi* əl əməyinə əsaslanan manufakturadan iri maşınlı sənaye istehsalına keçidlə ifadə olunan texniki-iqtisadi və sosial-siyasi dəyişikliklər sistemidir.

Başqa ölkələrdə İngiltərə məhsullarına tələbat böyük idi. Manufakturalarda isə məhsul istehsalı əl əməyinə əsaslandığı üçün həmin tələbatı ödəmirdi. Sənaye öz inkişafında yeni mərhələyə keçməli idi.

***Buxar maşını***



***Sənaye çevrilişi dövrünə aid dəzgah***

*Sənaye çevrilişi dövründə atın lokomotivlə yarışı*

İngiltərədə sənayenin daha yüksək mərhələyə keçməsinə şərait yaranmışdı. Aqrar çevriliş nəticəsində sənaye müəssisələrinə lazım olan işçi qüvvəsinin miqdarı artmışdı. İstehsalı genişləndirmək üçün müəssisə sahiblərinin imkanı genişlənmişdi. Aqrar çevrilişin başa çatmasında çəpərləmələrin rolu böyük idi. Dövlət iqtisadiyyata himayədarlıq etdiyi üçün sahibkarlardan alınan vergiləri azaltmışdı. Müəssisə sahibləri və yeni zadəganlar sənayeyə böyük həvəslə kapital ayırırdı. Daxili bazarın genişlənməsi ölkədə məhsul istehsalının artması ilə bağlı idi.



İngiltərədə sənaye çevrilişi XVIII yüzilliyin 60-cı illərində başlamışdı. İstehsal sahələrinin əksəriyyətində maşın və texnikadan istifadə edilirdi. Sənaye çevrilişi əvvəlcə yüngül sənayedə başladı. Çünki bu sahədə maşın tətbiqi çoxlu xərc tələb etmirdi və qısa müddətdə yüksək qazanc əldə edilirdi. Yüngül sənayedə isə toxuculuq məhsulu, xüsusilə pambıq parça istehsalı daha sürətlə artırdı. Hindistandan idxal edilən məhsulların rəqabətinə davam gətirmək üçün toxuculuq texniki cəhətdən təkmilləşdirilməli idi.

Beləliklə, sənaye çevrilişi dünyada ilk dəfə İngiltərədə həyata keçirildi.




Sənaye çevrilişinə şərait yaradan amilləri müəyyən edin.



9

# ŞİMALİ AMERİKA

“Möhür qanunu”, koloniyalar, hindular, “Boston çay qonaqlığı”, Filadelfiya konqresi, Corc Vaşinqton, “İstiqlaliyyət bəyannaməsi”, Konstitusiya

*Amerikanın kəşf olunmasından sonra avropalıların bu qitəyə maraqları daha da artmışdı. Burada müstəmləkələr əldə etmək uğrunda mübarizədə İspaniya, Portuqaliya, İngiltərə və Fransa dövlətləri xüsusilə seçilirdi. Müstəmləkəçilərin "Yeni dünya"ya gəlişi qitənin yerli əhalisinin kütləvi surətdə məhv edilməsi və sürətli məskunlaşma ilə müşahidə olunurdu.*

**Avropalılar Şimali Amerikada.** Şimali Amerikanın Atlantik okeanı sahillərində ilk ingilis koloniyası *(məskəni)* 1607-ci ildə salındı. Sonrakı illərdə koloniyaların və buraya köçüb gələn əhalinin sayı artmağa başladı. Gəlmələrin əksəriyyəti torpaqsız kəndlilər və dini təqiblərə məruz qalanlar idi. Bir müddət sonra koloniyaların sayı 13-ə çatdı. Onları birlikdə “Yeni İngiltərə” adlandırırdılar.

***Koloniyanın salınması***



Koloniyaları nə üçün “Yeni İngiltərə” adlandırırdılar?

İngilis məskənlərinin salındığı ərazilərin yerli əhalisi hindular idi. Onlara “qızıldərililər” də deyilirdi. İlk vaxtlar gəlmələrlə hindu əhali arasında dinc münasibətlər mövcud idi. Qəbilə icması halında yaşayan hindular ovçuluq və müəyyən qədər də əkinçiliklə məşğul olurdular. Tütün və qarğıdalı becərilməsini gəlmələr hindulardan öyrənmişdi.



*Hindular*



Gəlmələrin hinduların torpaqlarını zəbt etməsi və materikin içərilərinə doğru irəliləməsi onların arasında münaqişəyə səbəb olurdu. İngilis müstəmləkəçiləri yerli əhali ilə amansız rəftar edirdi.

Müxtəlif qəbilələrdən ibarət hinduların arasında birliyin olmamasından məharətlə istifadə edən müstəmləkəçilər bəzən qəbilələri bir-birinə qarşı qoyub onların güclərini zəifləwhichdirdilər. Odlu silahın nə olduğunu bilməyən hindular döyüşlərdə məğlub olurdular.

Nəticədə hinduların böyük bir hissəsi məhv edildi, yerdə qalanı isə qərbə doğru sıxışdırıldı.

S

Cəsur və döyüşkən hinduların müstəmləkəçilərə məğlub olmasının nəticələri nə oldu?

İngilislərlə yanaşı, koloniyalarda holland, alman, fransız, ispan və portuqallar da məskunlaşırdı. Avropada baş verən müharibələrdən, zülm və yoxsulluqdan xilas olmaq istəyən minlərlə insan Amerikaya axışırdı. Buna görə də əhalinin sayı sürətlə artırdı.

*Mühacir gətirən gəmi*



S

Koloniyalarda əhalinin sayının artması nə ilə bağlı idi?

**Koloniyaların idarə olunması.** Koloniyaların hamısında təbii şərait eyni deyildi. Bu amil onların fərqli iqtisadi inkişaf yolu keçməsinə səbəb olurdu. Şimal torpaqlarının münbit olmaması və qışın uzun sürməsi əkinçiliklə məşğul olmağı çətinləşdirirdi. Ona görə də köçkünlər toxuculuq emalatxanaları açır, ağac emalı müəssisələri təşkil edir və müxtəlif istehsal sahələri üzrə manufakturalar yaradırdılar. Muzdlu əməyin tətbiqi kapitalist münasibətlərinin inkişafına təsir edirdi. Ticarətin inkişafı nəticəsində Boston Şimali Amerikanın ən böyük limanına çevrilmişdi.

Cənub koloniyalarında torpaq sahibləri çəltik, tütün və qarğıdalı yetişdirilən geniş **plantasiyalar*** təşkil etmişdilər.



*Plantasiya* müəyyən bir məhsul istehsal edən iri əkinçilik təsərrüfatıdır.



Şimal və Cənub koloniyaları arasında əsas fərq nədən ibarət idi?

Plantasiya sahibləri müxtəlif bitkiləri becərmək üçün qul əməyindən istifadə edirdilər. Hinduları qula çevirmək mümkün deyildi. Ona görə də Afrikadan qaradərili insanları zorla gətirib qul kimi işlədirdilər.

Amerikaya ilk qaradərili afrikalı 1619-cu ildə Hollandiya gəmisi ilə gətirilmişdi. Gəlirli sahə kimi qul alveri getdikcə daha da genişlənirdi. İngiltərə Amerikadakı müstəmləkələrdən çox böyük gəlir əldə edirdi. İngilis kralı burada feodal qaydalarının tətbiq olunmasında maraqlı idi.



***Qulların gəmilərlə daşınması***



Şimali Amerikada qul əməyinin tətbiqi nə ilə nəticələndi?

***Plantasiya sahibinin qulları***

> Xəritə əsasında koloniyaların Atlantik okeanı sahillərində salınmasının səbəbini izah edin.

Koloniyalar kralın təyin etdiyi qubernatorlar tərəfindən idarə olunurdu. Hər bir koloniyada məclis fəaliyyət göstərirdi. O, daxili qanunlar qəbul edir, vergiləri müəyyənləşdirirdi. Yalnız qubernator məclisin qərarını ləğv etmək səlahiyyətinə malik idi. Koloniyalar arasında əlaqə genişləndikcə əhali bir-birinə qaynayıb qarışır, yeni bir xalq – Amerika xalqı formalaşırdı.

İngiltərə dövləti kolonistlərə *(koloniyaların sakinlərinə)* bir çox qadağalar qoymuşdu. Onlar qərbə doğru köçə bilməzdilər. Müstəmləkələrdə dəmir məmulatlarının hazırlanması və parça toxunması da qadağan olunmuşdu. Onlar hazır şəkildə İngiltərədən gətirilməli idi.

> İngiltərənin koloniyaların siyasi və iqtisadi inkişafına maneələr yaratmasının səbəblərini izah edin.

İngilis tacirlərinin maraqlarına uyğun olaraq koloniyaların başqa dövlətlərlə ticarətinə icazə verilmirdi.

1765-ci ildə İngiltərə parlamenti koloniyalara qarşı "Möhür" qanunu qəbul etdi. Qanuna görə əhali çap məmulatlarına rəsmi möhür vurmaq üçün vergi ödəməli idi. Koloniyaların təmsilçilərinin iştirakı ilə keçirilən müşavirədə ingilis mallarının **boykot*** edilməsi qərara alındı.



> *Boykot* ayrıca şəxs, təşkilat və dövlətlə əlaqələrin kəsilməsi, müəyyən malların alınmasından imtina və bu kimi hərəkətlərdən ibarət olan siyasi-iqtisadi mübarizə üsuludur.

1773-cü ildə "Ost-Hind" şirkətinin çayla yüklənmiş gəmiləri Boston limanına yan aldı. Boykotu pozmaq üçün çay ucuz qiymətə əhaliyə satılmalı idi. Buna etiraz edən və hindu geyimində olan bir qrup fəal gəmilərə hücum edib çay yeşiklərini körfəzə boşaltdı. "Boston çay qonaqlığı" adını almış bu hadisədən sonra İngiltərə hökuməti Boston limanını bağladı.

***"Boston çay qonaqlığı"***

**İstiqlaliyyət müharibəsi.** 1775-ci ildə koloniyalar İngiltərənin müstəmləkəçilik siyasəti əleyhinə üsyan qaldırdı. Müstəmləkələrin nümayəndələrinin iştirakı ilə Filadelfiyada konqres keçirildi.

*Filadelfiya konqresi*

Konqres Corc Vaşinqtonu azadlıq ordusunun komandanı elan etdi. Beləliklə, **koloniyaların azadlıq uğrunda mübarizəsi başladı**.



*Tomas Cefferson*

1776-cı il iyulun 4-də konqres **"İstiqlaliyyət bəyannaməsi"** qəbul etdi. Bununla müstəmləkələr İngiltərədən ayrılır və öz müstəqilliklərini elan edirdi. Üsyana qalxmış müstəmləkələr **Amerika Birləşmiş Ştatlarında** birləşirdi. Bu sənədin başlıca müəllifi Tomas Cefferson idi. "Bəyannamə"də deyilirdi:

- bütün insanlar bərabər yaranmışdır;
- xalq işğalçıları devirmək və öz hökumətini yaratmaq hüququna malikdir.

Beləliklə, "Bəyannamə"də xalq hakimiyyətin mənbəyi elan olunsa da, qulların və hinduların hüquqları nəzərə alınmadı.

O vaxtdan 4 iyul ABŞ-də İstiqlaliyyət günü kimi qeyd olunur.



*"İstiqlaliyyət bəyannaməsi"*

*Konqresdə "İstiqlaliyyət bəyannaməsi"nin qəbul edilməsi*

**T** "İstiqlaliyyət bəyannaməsi"nə aid cədvəli tamamlayın.

| "İstiqlaliyyət bəyannaməsi" | |
|---|---|
| Müsbət cəhətləri | |
| Mənfi cəhətləri | |

Müharibənin gedişində ABŞ əhalisi istiqlaliyyət tərəfdarlarına və əleyhdarlarına bölünmüşdü. Azadlıq mübarizəsinə inqilabi burjuaziya və vətənpərvər **plantatorlar**★ başçılıq edirdi.

★ *Plantator* iri torpaq sahibidir.

İngilis donanması ölkəni blokadaya almışdı. Amerika ordusu sərt məhrumiyyətlərə məruz qalırdı. Ordunun təminatı çox pis idi. Vaşinqton hərbi təlim görməmiş orduda intizamı möhkəmləndirmək üçün qəti tədbirlər həyata keçirdi. Nəticədə Vaşinqtonun ordusu Bostonu azad etdi.

**S** İstiqlaliyyət müharibəsində burjuaziya və plantatorların rolu nədən ibarət idi?

İngilis donanması Amerikadakı ordularına durmadan silah və kömək gətirirdi. Onlar Nyu-Yorku ələ keçirdikdən sonra Filadelfiyanı tutdular.

**S** Filadelfiya şəhərinin ABŞ üçün əhəmiyyəti nədən ibarət idi?

1777-ci ildə **Saratoqa yaxınlığında** baş verən döyüşdə ingilis ordusu məğlubiyyətə uğradıldı. Bu qələbə ABŞ-nin beynəlxalq nüfuzunu xeyli artırdı.

ABŞ İngiltərənin köhnə rəqibləri Fransa və İspaniya ilə ittifaqa girdi. Yardım üçün danışıqlar aparmaqdan ötrü məşhur alim və ictimai xadim Benjamin Franklin konqres tərəfindən Parisə göndərildi.



*Saratoqa döyüşündən sonra*



*Benjamin Franklin*



*İngilis ordusunun təslim olması*

Fransa İngiltərənin zəifləməsinə nail olmaq üçün ABŞ-nin müstəqilliyini tanıdı. Onunla ittifaq və ticarət sazişi bağlayıb borc verdi. Amerikaya fransız qoşunları, hərbi gəmilər və silah göndərildi. Fransız və ispan donanmaları ingilis gəmilərinə basqınlar etməyə başladı. İngiltərənin qüvvələri parçalandı.



Fransanın ABŞ-yə kömək etməkdə məqsədi nə idi?



Saratoqa döyüşünün əhəmiyyəti nədən ibarət oldu?

İngiltərə özünə müttəfiqlər tapa bilmədi. Onun başlıca qüvvələri 1781-ci ildə **Yorktaun yaxınlığında** mühasirəyə alındı.

Müqavimətin mənasız olduğunu görən ingilis qoşunları təslim oldu. **Bu qələbə ilə ABŞ müharibənin taleyini həll etdi.** Artıq İngiltərənin müharibəni davam etdirməyə gücü qalmamışdı.

1783-cü ildə **Parisdə (Versalda)** sülh müqaviləsi imzalandı. Alleqan dağlarından Missisipi çayına qədər olan ərazilər ABŞ-nin sərhədlərinə daxil olundu. Kanada isə İngiltərənin müstəmləkəsi olaraq qaldı.



Paris müqaviləsinin əhəmiyyətini izah edin.

*Paris müqaviləsinin bağlanması*



**Konstitusiyanın qəbul edilməsi.** 1787-ci ildə Filadelfiyada ştatların nümayəndələrinin iştirak etdiyi təsis məclisi çağırıldı. Məclis ölkənin konstitusiyasını qəbul etdi. Konstitusiya dövlətin idarəetmə formasını və quruluşunu müəyyənləşdirdi. ABŞ federativ respublika oldu.



***Filadelfiyada Konstitusiya məclisi***

Hakimiyyət üç qola bölündü. Qanunverici hakimiyyət Konqresə məxsus idi. O, iki palatadan ibarət idi. Yuxarı palata Senat, aşağı isə Nümayəndələr palatası adlanırdı. Hər ştatdan Senata iki nəfər senator göndərilirdi. Nümayəndələr palatasının üzvləri isə xalq tərəfindən seçilirdi.

İcraedici hakimiyyətin başında dörd ildən bir seçilən prezident dururdu. Qanunların icrası, xarici siyasətə nəzarət, hərbi qüvvələrə komandanlıq, ali məmurların təyin olunması və s. onun səlahiyyətlərinə daxil idi. Prezident qanunlar üzərində **veto*** da qoya bilərdi. ABŞ-nin ilk prezidenti 1789-cu ildə Corc Vaşinqton seçilmişdir.



*Veto* qadağanetmə, ləğvetmədir.

Məhkəmə sisteminə Ali Məhkəmə rəhbərlik edirdi. Hakimlər Senatın təsdiqi ilə prezident tərəfindən ömürlük təyin olunurdu. Ali Məhkəmə qanunların konstitusiyaya uyğunluğuna nəzarət edirdi.






ABŞ Konstitusiyasına görə hakimiyyət bölgüsünü təhlil edin.

ABŞ Konstitusiyası Avropa monarxiyalarındakı qaydalara nisbətən irəliyə doğru böyük addım idi. Bununla yanaşı, onun bəzi məhdud cəhətləri var idi. Konstitusiyada seçki hüququ göstərilmirdi. Bu, ştatların daxili qanunvericiliyi ilə müəyyən olunurdu. Demək olar ki, bütün ştatlarda seçki hüququ almaq üçün mülkiyyətə sahib olmaq lazım gəlirdi. Qadınlar, qullar, hindular və ağdərili əhalinin aşağı təbəqələri səsvermə hüququndan məhrum edilmişdi.

1791-ci ildə konstitusiyaya ilk əlavə və düzəlişlər edildi. Vətəndaşlara söz, yığıncaq, vicdan və digər hüquqlar verildi. Məhkəmənin hökmü olmadan həbslər keçirmək qadağan edildi.



ABŞ Konstitusiyasına aid cədvəli doldurun.

| Müsbət cəhətləri | Mənfi cəhətləri |
|---|---|
| | |
| | |

**İstiqlaliyyət müharibəsinin əhəmiyyəti.** Şimali Amerika istiqlaliyyət müharibəsi böyük beynəlxalq əhəmiyyətə malik oldu. Bu demokratiya quruluşunun monarxiya və müstəmləkə zülmü üzərində böyük qələbəsi idi. Yeni Dünyada iri müstəqil dövlətin yaranması Avropada inqilabi hərəkata təsir göstərdi. Xalqın hakimiyyətin yeganə mənbəyi olması və hakimiyyət bölgüsünün aparılması hüquqi demokratik dövlətin yaradılması, vətəndaş cəmiyyətinin qurulması yolunda mühüm addım oldu.



İstiqlaliyyət müharibəsinin hansı nəticələri oldu?



“Amerikanın atası” adını almış Corc Vaşinqton 57 yaşında, 1789-cu il fevral ayının 4-də keçirilən prezident seçkilərində ABŞ-nin ilk prezidenti seçilib.

ABŞ prezidentlərinin iqamətgahı olan Ağ Evin tikilməsi haqqında sərəncamı o imzalayıb. Binanın ilk təməl daşını o qoysa da, Corc Vaşinqtona Ağ Evdə işləmək qismət olmayıb. Çünki tikinti Vaşinqtonun vəfatından iki il sonra başa çatıb.

Amerika Birləşmiş Ştatlarının paytaxtının adı da Corc Vaşinqtonun soyadının şərəfinə qoyulub. Bu ərazini paytaxt kimi məhz o özü seçib. Bu şəhərdə onun şərəfinə ucaldılmış abidə şəhərin hər bir tərəfindən görünür. Konqresin qərarına görə şəhərdə bu abidədən hündür heç nə tikmək olmaz.

Amerikanın digər tarixi şəxsiyyətləri kimi Corc Vaşinqtonun şəkli də pul vahidlərinin üzərində öz əksini tapıb. İlk prezidentin şəkli bir dollarlıq əsginasın üzərinə vurulub.

Corc Vaşinqton heç vaxt Böyük Britaniyaya səfər etməyib. Hətta açıq bəyan edib ki, onun ayağının Londona dəyməsi heç vaxt mümkün olmayacaq. Sonralar, 1924-cü ildə Vaşinqtonun abidəsi Londona bəxş ediləndə onun bəyanatını nəzərə alaraq abidənin alt hissəsinə Amerika torpağı tökmüşlər.

1799-cu ilin soyuq qış günlərində sahələrə çıxanda Vaşinqton möhkəm soyuqlayıb. Tibbin inkişaf etmədiyi bir dövrdə həkimlər soyuqdəyməni çıxarmaq üçün yeganə vasitə kimi qan almağa üstünlük veriblər. Elə bu qanalma nəticəsində də Corc Vaşinqton 14 dekabr 1799-cu ildə 67 yaşında vəfat edib.



C.Vaşinqtonun fəaliyyəti ilə bağlı əlavə məlumatlar toplayın və “Amerikanın atası” mövzusunda esse yazın.



ABŞ tarixinə aid hadisələrə uyğun xronoloji cədvəl qurun.





*Corc Vaşinqton*

10

# FRANSA

Mütləqiyyət, maarifçilər, inqilab, respublika, yakobinçilər, Direktoriya, Napoleon Bonapart

*XVIII yüzilliyin sonlarına qədər Fransa mütləqiyyət ölkəsi idi. İnqilab nəticəsində bu rejimə son qoyuldu. Fransa inqilabı imtiyazlı təbəqələr və mütləqiyyətə qalib gələrək feodal qayda-qanunlarını tamamilə və əvəzsiz ləğv edən ilk inqilab oldu.*


*XIV Lüdoviq*

**Fransa inqilab ərəfəsində.** XVIII yüzillikdə Fransa hələ də feodal qaydalarının hökm sürdüyü ölkə olaraq qalırdı. Ölkə mütləqiyyət rejimi tərəfindən idarə olunurdu. Kral ölkədə mütləq söz sahibi idi və hər şey onun iradəsindən asılı idi. Bu vəziyyət XIV Lüdoviqin (1643–1715) hakimiyyəti dövründə ən yüksək səviyyəyə çatmışdı.

Orta əsrlər dövründən qalma bir çox vergilər hələ də alınırdı. Onlardan biri də vilayətlər arasında daşınan mallardan alınan daxili gömrük haqqı idi. Bu vergi vilayətlər arasında əlaqələri məhdudlaşdırırdı. Bu və mütləqiyyətin digər özbaşınalıqları Yüzillik müharibə dövründən formalaşmağa başlayan vətənpərvərlik və milli siyasi birliyə, demək olar ki, zərbə vuraraq yox edirdi. Fransızları bir arada saxlayan yeganə qüvvə isə mütləqiyyət quruluşu idi.




Fransada milli siyasi birlik və vətənpərvərliyin olmamasının səbəblərini müəyyən edin.

**Vergilər iltizam*** qaydaları ilə toplanırdı. Bu, əhalinin narazılığını daha da artırırdı.



*İltizam* orta əsrlərdə müəyyən məbləğdə pul ödənilməsi qarşılığında vergi yığılması üçün qazanılan səlahiyyətdir.

Ölkənin çox yerlərində məhkəmələr fəaliyyət göstərsə də, hakimlik irsi olaraq atadan oğula keçir, ya da rüşvət yolu ilə satın alınırdı. Bu da özbaşınalıqlara yol açırdı.



Rüşvətin dövlət idarəçiliyinə necə təsir etdiyini araşdırın.

Fransa XVIII yüzilliyin əvvəllərindən etibarən Avropada ən güclü dövlət olmaq yolunda müharibələrlə müşayiət olunan cəhdlər etmişdi. XIV Lüdoviqin hakimiyyəti dövründə bu sahədə xeyli uğurlar əldə edilmişdi. Lakin uzun sürən müharibələr Fransanı iqtisadi və siyasi cəhətdən sarsıtmışdı. 1756–1763-cü illərdə baş verən Yeddiillik müharibədə İngiltərəyə həm quruda, həm də dənizdə

**Fransa XVIII yüzillikdə**

məğlub olan Fransa Şimali Amerika və Hindistanda müstəmləkələrini itirsə də, Avropadakı sərhədlərini qoruya bildi. Beləliklə, Fransa İngiltərənin okeanlarda üstünlüyünü qəbul etdi və müstəmləkə siyasətində böyük zərbə almış oldu.

Fransa **Yeddiillik müharibənin** əvəzini çıxmaq üçün fürsət axtarırdı. Bu fürsət koloniyaların Şimali Amerikada İngiltərəyə qarşı çıxışları zamanı yarandı. Geniş müharibəyə çevrilən bu mübarizədə Fransa əvvəlcə gizli şəkildə koloniyalara pul və silahla yardım etdi. Sonra isə ABŞ ilə müttəfiqlik müqaviləsi imzalayaraq müharibənin sonuna qədər yardım etməyi öhdəsinə götürdü. İngiltərə ilə maraqları toqquşan İspaniya və Hollandiya da Fransa ilə ittifaq yaradıb birlikdə ona qarşı mübarizə apardı.

Müttəfiqlərin köməyi ilə koloniyaların azadlıq mübarizəsi qələbə ilə başa çatdı. İngiltərə onların müstəqilliklərini tanımağa məcbur oldu. Lakin Fransa bu müharibədə gözlədiyi gəliri qazana bilmədi və iqtisadi cəhətdən çox ağır vəziyyətə düşdü. Amerikadakı ingilis koloniyalarının müstəqillik uğrunda mübarizəsi fransızlar tərəfindən hüquq və azadlıqların müdafiəsi uğrunda mübarizə kimi təsvir edilmişdir. Bu baxımdan 1776-cı ildə amerikalılar tərəfindən qəbul edilmiş "İstiqlaliyyət bəyannaməsi", 1783-cü ildə isə onların müstəqilliyinin tanınması Fransada rəğbətlə qarşılandı. İstiqlaliyyət müharibəsində iştirak edən fransızlar "İstiqlaliyyət bəyannaməsi"ndə irəli sürülən ideyaları geri qayıdarkən ölkələrinə gətirdilər. Bu ideyalar Fransanın mövcud mütləqiyyət quruluşu ilə mübarizədə mühüm rola malik oldu.



Fransanın ABŞ-dəki proseslərə yardım etməsinin səbəb və nəticələrini müəyyən edin.

Fransanın Yaxın Şərq siyasətində əsas yeri Osmanlı ilə münasibətlər tuturdu. İki dövlət arasında sıx əməkdaşlıq mövcud idi. Bu əməkdaşlıq hələ XVI yüzilliyin birinci yarısında başlamışdı. Siyasi və daha çox iqtisadi sahələrdə olan əməkdaşlıq Fransanın xeyrinə idi.

XVIII yüzilliyin sonlarında Fransa Avropanın böyük dövləti imicini qoruyub saxlamışdı. Lakin onun daxilində baş verən proseslər ölkədə yeni və daha böyük hadisələrə gətirib çıxardı. **Bu, 1789-cu ildə başlayan "Böyük inqilab" idi**.

XVIII yüzilliyin başlanğıcında Fransada mütləqiyyət ən yüksək zirvəyə çatmışdı. Kral ölkənin mütləq hakimi idi, bütün dövlət qurumları onun əlində cəmləşmişdi. XIV Lüdoviq bunu belə ifadə edirdi: "Dövlət mənəm!" Bununla bərabər, mütləqiyyət xalqın maraqlarından daha çox diqqətini xarici siyasətə yönəltmişdi. Nəticədə XIV Lüdoviqin hakimiyyətinin sonuna yaxın Fransanın daxili çöküşü başlasa da, kralın şəxsi nüfuzu ilə bu, bir müddət gecikdi. XIV Lüdoviqdən sonra hakimiyyətə gələn kralların zəifliyi labüd çöküşü və parçalanmanın qarşısını ala bilmədi, əksinə, onu sürətləndirdi. Buna baxmayaraq, krallar ətrafı ilə birlikdə dəbdəbəli həyat yaşamaqda davam edirdi. Bu da xalqın mütləqiyyət quruluşuna nifrətini çoxaldırdı. Beləliklə, XVIII yüzilliyin sonlarında dövlətlə xalq arasında münasibətlər daha da pisləşdi. Digər tərəfdən, dövlətin xarici siyasətdəki uğursuzluqları Fransada iğtişaşları daha da artırdı və mütləqiyyətə qarşı olan ideyaları gücləndirdi. Fransız mütəfəkkirləri bu məsələdə mühüm rol oynayırdılar.

**Maarifçilik. Avropada İntibah dövrü və Reformasiya hərəkatı nəticəsində yaranan fikirlər XVIII yüzillikdə yeni düşüncə formalarının yaranmasına mühüm təsir göstərmişdi.** İntibah dövründə insan düşüncəsi formal çərçivədən çıxmış və sərbəst inkişaf etməyə başlamışdı. Reformasiya isə insan düşüncəsinin dini çərçivədən müəyyən qədər azad olmasına səbəb olmuşdu.

Cəmiyyət sosial bərabərsizliyə əsaslanan bir quruluşda yaşamaqda davam edirdi. Lakin Fransada düşüncə sahəsində baş vermiş böyük irəliləyişlər cəmiyyətə də təsir etdi. **XVIII yüzilliyin Fransada sürətlə yayılmağa başlamış yeni düşüncə forması Maarifçilik**

**adlanırdı.** İnqilabın Avropanın başqa ölkəsində deyil, Fransada baş verməsi ölkədə xalqa yol göstərə biləcək bir çox mütəfəkkirlərin olması ilə əlaqədar idi.

Maarifçilik burjuaziyanın və xalqın mütləqiyyət qaydalarına qarşı etirazını əks etdirən ideyalar sistemi idi. Fransa maarifçilərinin dünyagörüşünə İngiltərə maarifçilərinin ideyaları da təsir göstərmişdi. Lakin İngiltərədə maarifçilik inqilabdan sonra, Fransada isə inqilabdan əvvəl formalaşmışdı. Ona görə də Fransa maarifçiləri feodal mütləqiyyət qaydalarını daha kəskin tənqid edirdilər. Maarifçilər hesab edirdilər ki, cəmiyyət öz üzvlərinin yaxşı yaşamasını, azadlıq və mülki bərabərlik kimi hüquqlardan istifadə etməsini təmin etməli idi.



İngiltərə və Fransa maarifçiliyini müqayisə edin.



*Volter*

Maarifçilik cərəyanının görkəmli nümayəndələrindən biri olan **Monteskyö** mütləqiyyətə qarşı idi. Ölkəsində İngiltərədə olduğu kimi, məhdud monarxiyanın qurulmasını istəyirdi. O, hakimiyyətin qanunverici, icraedici və məhkəmə hakimiyyətlərinə bölünməsinin tərəfdarı idi.

Vicdan və fikir azadlığının tərəfdarı olan **Volter** isə kilsəyə və mövcud quruluşa qarşı idi. O, mütləqiyyətin ilahi hüquqlara dayanmadığını göstərməyə çalışır, onun bu qüdrətinin məhv edilməsini və mütləqiyyət rejiminin ləğv olunmasını istəyirdi.

**Jan Jak Russo** sosial həyatın yenidən təşkilinin tərəfdarı idi. O, əsasən, aşağı təbəqənin mənafeyini müdafiə edir, ayrı-ayrı şəxslər arasında bərabərliyin zəruri olduğunu vurğulayırdı. Russo monarxiyanın tamamilə ləğvini və xalqın suverenliyinə əsaslanan Respublika quruluşunun tərəfdarı idi.



Russonun ideyalarının digər maarifçilərin ideyaları ilə oxşar və fərqli cəhətlərini müəyyən edin.



*Russo*

**Ölkədə sosial vəziyyət.** İnqilabdan əvvəl Fransada sosial bərabərsizliyə əsaslanan sistem mövcud idi. Bu sistemə görə xalq, ümumilikdə, imtiyazlı və imtiyazsız olmaqla iki qrupa bölünmüşdü. Ruhanilər və zadəganlar imtiyazlı təbəqəyə, qalan əhali – burjuaziya, sənətkarlar, muzdlu işçilər, kəndlilər və b. imtiyazsız təbəqəyə daxil idilər.

**Zadəgan və ruhanilərin** ümumi əhalinin az bir hissəsini təşkil etməsinə baxmayaraq, çox böyük səlahiyyətlərə malik idilər. Vergi toxunulmazlığı hüququna malik bu təbəqə həmçinin ölkədə yüksək vəzifələrə sahiblik edirdi.

**Burjuaziya,** əsasən, iri yaşayış mərkəzlərində yaşayırdı. Sənayenin və ticarətin inkişafı bu təbəqənin adı ilə bağlı idi. Ziyalılar, adətən, bu təbəqədən idi. Maddi və mənəvi baxımdan güclü olan bu təbəqə Fransanın gələcəyinə öz təsirini göstərə biləcək vəziyyətdə idi. Onlar ölkədə vergi ödəyən təbəqələrdən biri olsalar da, siyasi və sosial hüquqlardan məhrum idilər. Getdikcə güclənən bu təbəqə zadəganlarla aralarında olan fərqin ləğv edilməsini, bərabərliyin əldə edilməsini tələb etməyə başlamışdı. Bu da inqilabın başlamasına təsir edən səbəblərdən biri idi.

**Kəndlilər** əhalinin böyük hissəsini təşkil edirdi. Ölkədə, əsasən, vergi və mükəlləfiyyətlər onların üzərinə düşürdü. Azad olsalar da, burjuaziya kimi, kəndlilər də siyasi hüquqlardan məhrum idilər. Kəndlilərin vəziyyətinin ağırlığı mövcud quruluşa qarşı narazılığın artmasına səbəb olurdu. **Nəticədə kəndlilər inqilabın əsas hərəkətverici qüvvəsinə çevrildi.**

**İnqilabın başlanması və inkişafı.** XVI Lüdoviq taxta çıxanda Fransanın maliyyə vəziyyəti ağır idi. Əhali vergilərin ağırlığından şikayətlənirdi.

Kral maliyyə böhranını həll etmək üçün uzun müddət çağırılmayan Baş ştatları 1789-cu ilin mayında çağırmağa məcbur oldu. Əvvəllər olduğu kimi, burada zadəganlar, ruhanilər və aşağı təbəqə təmsil olunurdu. Baş ştatların açılışı zamanı kral əsas məsələnin maliyyə problemlərini həll etmək olduğunu bildirdi. Xalqın gözlədiyi islahatlar barədə heç bir çağırış edilmədi.






Ümumi əhali




Torpaq mülkiyyəti




Vergitutma


Ruhanilər


Zadəganlar


Aşağı təbəqə

**Fransada böyük çıxışların başlaması**




Böyük çıxışların əsas istiqamətləri

BÖYÜK BRİTANİYA

LA-MANŞ BOĞAZI

MÜQƏDDƏS ROMA İMPERİYASI

BİSKAY KÖRFƏZİ

İSPANİYA

ARALIQ DƏNİZİ

Lill
Arras
Amen
Sedan
Ruan
Valmi
Paris
Reni
Le-Man
Orlean
Tul
Nansi
Strasburq
Anje
Dijon
Somyur
Never
Bezanson
La-Roşel
Puatye
Qere
Mulen
Lion
Sent
Klermon
Amber
Qrenobl
Bordo
Man
Eks
Langedok
Tulon
Po
Fua

Səsvermə məsələsində isə böyük gərginlik yarandı. Belə ki ruhanilər və zadəganlar təbəqələr əsasında səsvermənin keçirilməsini tələb etsələr də, xalq nümayəndələri buna qarşı çıxdılar. Onlar hər kəsin ayrılıqda səs verməsini müdafiə etdilər. Müzakirələr nəticəsiz qaldı. Beləliklə, təbəqələr arasında mübarizə başladı.




Səsvermə məsələsində ruhani və zadəganların aşağı təbəqə ilə razılaşmamasının səbəbi nə idi?

Bundan sonra aşağı təbəqə nümayəndələri xalqın böyük əksəriyyətini təşkil etdiklərini elan edərək özlərini Milli Məclis adlandırdılar. Onlar xalqın suveren hüququnu önə çəkərək məclisin razılığı olmadan vergi yığılmasının yolverilməz olduğunu bildirdilər. Həmçinin aşağı təbəqə ruhaniləri və zadəganları da məclisdə iştirak etməyə dəvət etsələr də, onlar bu dəvətə müsbət cavab vermədilər. Ancaq sonradan ruhanilərin aşağı təbəqəsi və narazı zadəganlar Milli Məclisə qoşuldular.

Kral məclisin iclaslarının keçirilməsinə mane olmağa çalışırdı. Bu onların daha da sıx əməkdaşlıq etməsinə şərait yaratdı. Kralın maneçiliyinə baxmayaraq, Milli Məclisin iclası keçirildi. İclas iştirakçıları Konstitusiya qəbul etməyi qarşıya məqsəd qoydu.

Milli Məclisin Fransa üçün Konstitusiya hazırlamaq addımı yüzilliklər boyu davam edən monarxiya rejimini dəyişmək məqsədi güdürdü. Bu addım krala qarşı çıxmaq demək idi. Bununla da inqilab başlamış oldu. Beləliklə, Fransanın düşdüyü maliyyə böhranının həllini tapmaq üçün toplanmış Baş ştatlar ilk anlarından öz mahiyyətini dəyişərək inqilabi forma aldı. Bundan sonra hər şey sürətlə inkişaf etməyə başladı.

Baş verən proseslər kral, ruhanilər və zadəganları narahat edirdi. Bu vəziyyətdən xəbərdar olan məclis nümayəndələri xalq kütləri ilə birlikdə mütləqiyyətin simvoluna çevrilmiş Bastiliya qalasına hücum edib ələ keçirdilər. **Bastiliyanın alınması Fransa inqilabının ilk qələbəsi idi.** Hadisələr tez bir zamanda Fransanın digər bölgələrinə yayılmağa başladı. Nəticədə kralın gücü xeyli azaldı, ruhanilərin və zadəganların çoxu xaricə qaçdı.

***Bastiliya qalasının ələ keçirilməsi***



1789-cu ilin avqustunda feodal qaydalarının ləğv edilməsi haqqında bəzi vacib qərarlar qəbul edildi: Fransada feodal sistemi ləğv edilməli, ruhanilər və zadəganlar vergi ödəməmək hüquqlarından və digər üstünlüklərindən könüllü imtina etməli idi. Hər kəs bərabər vergi ödəməklə yanaşı, dövlət vəzifələri və rütbələri əldə edə bilərdi. Beləliklə, feodal qaydalarına əsaslanan sistem sıradan çıxır, bərabərlilik prinsipi əsasında yeni sistem qurulurdu.

1789-cu ildə ABŞ-nin "İstiqlaliyyət bəyannaməsi" əsasında "İnsan və vətəndaş hüquqları haqqında Bəyannamə" qəbul edildi. Bəyannaməyə əsasən vətəndaşların azad və bərabər olması vurğulanır, hakimiyyətin mənbəyinin xalq olduğu elan edilirdi. Bəyannamədə həmçinin insanların öz təhlükəsizliyini təmin etmək, zülmə müqavimət göstərmək, söz, mətbuat kimi hüquq və azadlıqlar, xalqın suverenliyi kimi prinsiplər də əksini tapmışdı.

Uzun müzakirələrdən sonra 1791-ci ildə Konstitusiya qəbul olundu. Konstitusiyada suverenlik hüququnun xalqda olduğu və hakimiyyətin bölünməsi prinsipi qəbul edilirdi. Kral icra hakimiyyətinin başçısı olsa da, onun səlahiyyətləri Konstitusiya ilə məhdudlaşdırılırdı. **Beləliklə, Fransada mütləq monarxiyaya son qoyulması ilə konstitusiyalı monarxiya dövrü başlandı.**



1791-ci il Konstitusiyasının əhəmiyyəti nə idi?

Fransa daxilində üsyanlar və çəkişmələr davam edirdi. Həmçinin yeni rejimi devirib monarxiya qaydalarını bərpa etmək istəyən qonşu dövlətlərlə də müharibələr gedirdi. 1792-ci ildə respublika tərəfdarları kralı həbs etdilər. Sentyabrda ölkənin şimalında işğalçı qüvvələrin hücumu dayandırıldı və Fransa tarixində **ilk dəfə Respublika elan edildi.** Beləliklə, yüzilliklərlə davam edən monarxiya idarəçiliyi sona çatdı. Kral dövlətə xəyanətdə ittiham olunaraq edam edildi.

**Yakobin** **diktaturası.** Kralın edamı respublikanın daxili və xarici vəziyyətini gərginləşdirdi. Qonşu ölkələrin kralları vəziyyətdən ciddi narahatlıq keçirdilər. Avstriya, Prussiya, İspaniya, İngiltərə və Hollandiya Fransaya qarşı mübarizəyə başladı.

*Yakobinçilər* – inqilab zamanı Müqəddəs Yakov kilsəsində toplaşıb iclas keçirən inqilab tərəfdarları

Belə bir vaxtda ölkənin siyasi idarəçiliyində tez-tez dəyişikliklər baş verirdi. Fransa Respublikasının 1793–1794-cü illər dövrü Yakobin diktaturası adlanır. Bu diktatura dövründə yaradılmış geniş səlahiyyətlərə malik olan İctimai Təhlükəsizlik Komitəsi rəqiblərinə qarşı sərt tədbirlər görürdü. Buna görə də Komitənin fəaliyyət dövrü Terror dövrü də adlanır.

İctimai Təhlükəsizlik Komitəsinin rəhbəri Robespyer terrorla bağlı mövqeyini belə ifadə edirdi:

*İnqilab azadlıq düşmənlərinə qarşı aparılan bir müharibədir. İnqilab müharibə hökumətidir. Hökumət ayıq-sayıq olmalı, ildırım sürəti ilə hərəkət etməlidir. Əlinizdə olan məcburetmə gücü terrordur.*



***Robespyer***

*"İnsan və vətəndaş hüquqları haqqında Bəyannamə"*

# DÉCLARATION DES DROITS DE L'HOMME ET DU CITOYEN,

Décretés par l'Assemblée Nationale dans les séances des 20.21 23,24 et 26 aoûst 1789, acceptés par le Roi

## PRÉAMBULE

LES représantans du peuple François, constitués en assemblée nationale, considérant que l'ignorance, l'oubli ou le mépris des droits de l'homme sont les seules causes des malheurs publics et de la corruption des gouvernemens ont résolu d'exposer dans une déclaration solemnelle, les droits naturels inaliénables et sacrés de l'homme: afin que cette déclaration, constamment présente à tous les membres du corps social, leur rappelle sans cesse leurs droits et leurs devoirs; afin que les actes du pouvoir législatif et ceux du pouvoir exécutif, pouvant être à chaque instant comparés avec le but de toute institution politique, en soient plus respectés; afin que les réclamations des citoyens, fondées désormais sur des principes simples et incontestables, tournent toujours au maintien de la constitution et du bonheur de tous.

EN conséquence, l'assemblée nationale reconnoit et déclare, en presence et sous les auspices de l'Etre suprême les droits suivans de l'homme et du citoyen.

### ARTICLE PREMIER.

LES hommes naissent et demeurent libres et égaux en droits; les distinctions sociales ne peuvent être fondées que sur l'utilité commune.

### II.

LE but de toute association politique est la conservation des droits naturels et imprescriptibles de l'homme; ces droits sont la liberté, la propriété, la sureté, et la résistance à l'oppression.

### III.

LE principe de toute souveraineté réside essentiellement dans la nation, nul corps, nul individu ne peut exercer d'autorité qui n'en émane expressément.

### IV.

LA liberté consiste à pouvoir faire tout ce qui ne nuit pas à autrui Ainsi, l'exercice des droits naturels de chaque homme, n'a de bornes que celles qui assurent aux autres membres de la société la jouissance de ces mêmes droits; ces bornes ne peuvent être déterminées que par la loi

### V.

LA loi n'a le droit de défendre que les actions nuisibles a la société, Tout ce qui n'est pas défendu par la loi ne peut être empêché, et nul ne peut être contraint à faire ce qu'elle n'ordonne pas.

### VI.

LA loi est l'expression de la volonté générale; tous les citoyens ont droit de concourir personnellement, ou par leurs représentans, à sa formation; elle doit être la même pour tous, soit qu'elle protege, soit qu'elle punisse, Tous les citoyens étant égaux à ses yeux, sont également admissibles à toutes dignités, places et emplois publics, selon leur capacité, et sans autres distinction que celles de leurs vertus et de leurs talens

### VII.

NUL homme ne peut être accusé, arreté ni détenu que dans les cas déterminés par la loi, et selon les formes qu'elle à prescrites, ceux qui sollicitent, expédient, exécutent ou font exécuter des ordres arbitraires, doivent être punis; mais tout citoyen appelé ou saisi en vertu de la loi, doit obéir a l'instant, il se rend coupable par la résistance.

### VIII.

LA loi ne doit établir que des peines strictement et évidemment nécessaire, et nul ne peut être puni qu'en vertu d'une loi établie et promulguée antérierement au délit, et légalement appliquée.

### IX.

TOUT homme étant présumé innocent jusqu'à ce qu'il ait été déclaré coupable, s'il est jugé indispensable de l'arrêter, toute rigueur qui ne serait pas nécessaire pour s'assurer de sa personne doit être sévérement réprimée par la loi.

### X.

NUL ne doit être inquiété pour ses opinions, mêmes religieuses pourvu que leur manifestation ne trouble pas l'ordre public établi par la loi.

### XI.

LA libre communication des pensées et des opinions est un des droits les plus precieux de l'homme; tout citoyen peut donc parler écrire, imprimer librement: sauf à répondre de l'abus de cette liberté dans les cas déterminés par la loi.

### XII.

LA garantie des droits de l'homme et du citoyen nécessite une force publique; cette force est donc instituée pour l'avantage de tous, et non pour l'utilité particuliere de ceux a qui elle est confiée.

### XIII.

POUR l'entretien de la force publique, et pour les dépenses d'administration, une contribution commune est indispensable; elle doit être également répartie entre les citoyens en raison de leurs facultées

### XIV.

LES citoyens ont le droit de constater par eux même ou par leurs représentans, la nécessité de la contribution publique, de la consentir librement, d'en suivre l'emploi, et d'en déterminer la quotité, l'assiette, le recouvrement et la durée.

### XV.

LA société a le droit de demander compte a tout agent public de son administration.

### XVI.

TOUTE société, dans laquelle la garantie des droits n'est pas assurée, ni les séparation des pouvoirs déterminée, n'a point de constitution

### XVII.

LES propriétés étant un droit inviolable et sacré, nul ne peut en être privé, si ce n'est lorsque la nécessité publique, légalement constatée, l'exige évidemment, et sous la condition d'une juste et préalable indemnité.

AUX REPRESENTANS DU PEUPLE FRANCOIS

*İctimai Təhlükəsizlik Komitəsi*

Bütün mükəlləfiyyətlərin ləğvi haqqında qanunun verilməsi həm kəndlilərin, həm də ölkənin mənafeyinə uyğun idi. Ona görə kəndlilər Avropa dövlətlərinin koalisiyasına və qiyamçılara qarşı mübarizədə inqilabın nailiyyətlərini daha qətiyyətlə müdafiə etməyə başladılar.

Təhsilə isə xüsusi diqqət yetirilmişdir. Belə ki Fransada ilk dəfə pulsuz ibtidai təhsil haqqında qanun qəbul edilmiş, bir sıra ali təhsil və mədəniyyət müəssisələri yaradılmışdı.

Yakobinçilər respublikanı müdafiə etmək üçün ölkənin bütün qüvvələrini səfərbər etməyə çalışırdılar.

Qısa müddətdə Fransanın silahlı qüvvələri yenidən quruldu. Milli ordu ümumi hərbi mükəlləfiyyət prinsipi əsasında yaradıldı. Orduya istedadlı və xalq içərisində böyük nüfuz qazanmış şəxslər cəlb olundu. Ordunu silahla təmin etmək üçün hökumətin təşəbbüsü ilə manufakturalar yaradıldı. Ölkənin müdafiə qabiliyyətinin möhkəmləndirilməsində elmi-texniki nailiyyətlərdən geniş istifadə olunurdu.

Ölkədə yaradılan ruh yüksəkliyi, gənclərin kütləvi şəkildə orduya cəlb olunması və ordunun güclənməsi ilə düşmənlərin hücumlarının qarşısı alındı. Lakin zorakılıq tədbirləri dözülməz hala çevrildiyindən varlanmış burjuaziya və Milli ordu birlikdə 1794-cü ildə Yakobin diktaturasını devirdi.




Yakobinçilərin fəaliyyəti ilə bağlı cədvəli tamamlayın.

| YAKOBİNÇİLƏRİN FƏALİYYƏTİ | |
|---|---|
| Müsbət cəhətləri | Mənfi cəhətləri |
| | |
| | |

1795-ci ildə yeni Konstitusiya qəbul edildi. Bu Konstitusiyaya, əsasən, icra hakimiyyətinin beş nəfərdən ibarət olan və Məclis tərəfindən seçilən Direktoriya adlı quruma verilməsi nəzərdə tutulurdu. Beləliklə, Fransada Direktoriya dövrü başladı.

Lakin kral tərəfdarları və respublikaçılar yeni rejimdən razı qalmadılar və xalqı üsyana təhrik etdilər. Üsyanlar gənc general Napoleon Bonapart tərəfindən yatırıldı. Bu onun ölkə daxilində nüfuzunu yüksəltdi. Direktoriya dövründə Napoleon tərəfindən Avstriya və Misirə yürüşlər təşkil edildi.

Bu dövrdə ölkədə daxili siyasi və iqtisadi tədbirlər uğursuz oldu. Fransa ordularının məğlubiyyəti ölkə daxilində hökumətə qarşı narazılığı artırdı. Misirdə türklərə məğlub olan Napoleon ölkəyə qayıdaraq 1799-cu ildə Direktoriyanı devirib hakimiyyəti ələ keçirdi. Beləliklə, **Fransa inqilabı başa çatdı.**

**Fransa inqilabının Avropa ölkələrinə təsiri.** Fransada inqilabın başladığı ilk vaxtlarda digər Avropa ölkələrində böyük reaksiya yox idi. Əksinə, Fransanın bu daxili çəkişmələrdən zəif çıxacağı fikri formalaşmışdı. Fransanın işğalçılıq məqsədilə müharibə etməkdən əl çəkməsi 1791-ci il Konstitusiyasında öz əksini tapmışdı. Bu baxımdan baş verən hadisələr daxili proseslər kimi görünürdü.

Lakin inqilabın qısa müddətdə yüksəlməsi, monarxiyanın devrilməsi Avropa monarxlarını qorxutdu. Buna görə də onlar inqilaba qarşı tədbirlər görməyə başladı. Lakin onların öz aralarında olan fikir ayrılıqları inqilaba qarşı mübarizəni çətinləşdirirdi. Rusiya və Avstriya Osmanlı imperiyası ilə müharibə (1787–1791-ci illər) vəziyyətində idi. Prussiya Avstriyaya hücum etməyə hazırlaşırdı. Lakin Fransa inqilabı bu dövlətləri öz aralarındakı ədavətə son qoymağa və onları Fransaya qarşı birləşdirməyə vadar etdi.




Avropa dövlətləri nə üçün aralarında olan fikir ayrılıqlarına son qoydu?

Avstriya və Prussiya 1791-ci ildə monarxiya sisteminin yenidən qurulması üçün birlikdə Fransaya müdaxilə etməyi qərara aldı. 1792-ci ildə Fransa və Avstriya arasında müharibənin başlanması ilə **Koalisiya müharibələri** başladı.

Respublikanın yaradılması və kralın edam olunması Avropa dövlətlərinin Fransaya qarşı birləşməsinə səbəb oldu. Fransanın müstəmləkələr uğrunda yenidən mübarizəyə başlaması İngiltərə başda olmaqla İspaniya və Hollandiyanın da müharibəyə qoşulmasına səbəb oldu. Beləliklə, **Koalisiya*** müharibələri Avropanın böyük hissəsinə yayılmış oldu.



*Koalisiya* – müəyyən məqsədə çatmaq üçün dövlətlərin yaratdıqları könüllü birlik

Müharibənin ilk illərində ordunun müharibəyə hazır olmaması, cəlb edilən könüllülərin pis silahlanması, zabitlərin bir qisminin ölkədən çıxıb getməsi Fransanın məğlubiyyətinə səbəb oldu. Lakin 15 min könüllünün orduya yazılması düşmənləri dayandıra bildi. Hətta əks-hücuma keçən Fransa ordusu Reyn çayının bir hissəsini və Hollandiyanı işğal etdi. Fransanın bir çox hərbi uğurlarından sonra 1795-ci ildə Prussiya, Hollandiya və İspaniya Fransa ilə sülh müqavilələri imzaladı. Bununla da Fransanın yeni rejimi bu dövlətlər tərəfindən rəsmən tanınmış oldu.

**Avropa XVIII yüzilliyin sonlarında**




ATLANTİK OKEANI
PORTUQAL KRALLIĞI
İSPANİYA KRALLIĞI
Madrid
Dublin
London
BÖYÜK BRİTANİYA KRALLIĞI
FRANSA KRALLIĞI
Paris
Brüssel
ŞİMAL DƏNİZİ
ARALIQ DƏNİZİ
SARDİNİYA KRALLIĞI
Cenevrə
Mayntz
MÜQƏDDƏS ROMA İMPERİYASI
DANİMARKA VƏ NORVEÇ KRALLIĞI
Roma
SİCİLİYA KRALLIĞI
ADRİATİK DƏNİZİ
İSVEÇ KRALLIĞI
BALTİK DƏNİZİ
AVSTRİYA KRALLIĞI
Budapeşt
Varşava
POLŞA KRALLIĞI
OSMANLI İMPERİYASI
QARA DƏNİZ
RUSİYA İMPERİYASI

Avstriya və İngiltərə isə müqavilə imzalamamış, müharibəni davam etdirmişdilər. Ancaq müqavimət göstərə bilməyən Avstriya tezliklə Şimali İtaliyada Napoleon tərəfindən ağır məğlubiyyətə uğradıldı. Bundan sonra onlar arasında müqavilə imzalandı. Müqavilə nəticəsində hər iki dövlət Balkanlara daxil olmuş oldu. Bu, Avropanın iki güclü dövlətini Osmanlı imperiyası ilə birbaşa sərhəddə mübarizəyə sövq etdi.

Fransa İngiltərənin Hindistanla əlaqələrində mühüm yer tutan Misiri ələ keçirib onu sülh müqaviləsi imzalamağa məcbur etmək istəyirdi. Buna görə də fransız donanması 1798-ci ildə Napoleonun başçılığı ilə Misirə hücum etdi. Fransanın Misiri ələ keçirməsi Osmanlı, İngiltərə və Rusiyanın yenidən ona qarşı birləşməsinə səbəb oldu.



Fransa hansı yolla İngiltərəni sülhə məcbur etmək istəyirdi?

Napoleon 1799-cu ildə müharibədə məğlub olub Fransaya döndü. Fransanın Misirdə müharibə aparmasından istifadə edən Avstriya Rusiyanın yardımı ilə Şimali İtaliyanı geri qaytardı.

Napoleon 1799-cu ildə ölkədə hakimiyyəti ələ keçirdikdən sonra Fransaya qarşı birləşən ölkələrə yeni müharibəyə başladı. İlk olaraq Avstriya sıradan çıxarıldı. Rusiyanın da mənafeyi müttəfiqləri ilə üst-üstə düşmədiyindən Fransa ilə yaxınlaşmağa başladı.

***Napoleon Bonapart***



*1802-ci il müqaviləsinin nəticələrini əks etdirən karikatur*

Fransanın Avropada üstün mövqeyə malik dövlət olmasını istəməyən İngiltərə onunla təkbaşına mübarizə aparmalı olsa da, bunu axıra qədər davam etdirə bilmədi. 1802-ci ildə onlar arasında bağlanmış müqaviləyə əsasən İngiltərə Fransa Respublikasını və onun ələ keçirdiyi əraziləri tanıdı. Fransa isə Misirdən geri çəkildi. Bununla da Fransa ona qarşı aparılan müharibələri uğurla başa çatdırdı. Koalisiya müharibələri Avropada güc tarazlığını və siyasi coğrafiyanı böyük ölçüdə dəyişmiş, yeni dövlətlərarası münasibətlərin yaranmasına səbəb olmuşdur.

**İnqilabın nəticələri.** Maliyyə və iqtisadi səbəblərdən başlayan Fransa inqilabı dərhal bərabərlik və azadlıq probleminə çevrilərək qısa müddətdə yüksəldi. İnqilabın gətirdiyi millət, millətçilik, milli suverenlik, demokratiya, dünyəvilik və ədalət kimi düşüncə və anlayışlar inqilabçı ordular tərəfindən Avropaya yayılmışdı. Koalisiya müharibələri Avropanı siyasi, iqtisadi və sosial cəhətdən köklü surətdə dəyişdi. Əvvəllərdən Avropada qurulmuş olan qüvvələr nisbəti Napoleon müharibələri ilə tamamilə pozuldu.

Fransa inqilabı beynəlxalq siyasi həyatda millətlərin hüquqları, öz gələcəyi üzərində suverenliyi, bərabərliyi, təbii sərhədlər kimi prinsiplər formalaşdırdı. Özündən əvvəlki inqilablardan fərqli olaraq, Fransa inqilabında burjuaziya tam hakimiyyətə sahib olmuşdur.

Fransa inqilabı imtiyazlı təbəqələr və monarxiya üzərində qələbə qazanan, feodal qayda-qanunlarına sona qədər zərbə vuran ilk inqilab oldu.

**FRANSA İNQİLABI DÖVRÜNDƏ QƏBUL OLUNMUŞ KONSTİTUSİYALAR**

**1791-ci il Konstitusiyası**

- Suverenlik hüququnun xalqda olduğu və hakimiyyətin bölünməsi prinsipi qəbul edilirdi.
- Kral hakimiyyətin bölünməsinə əsasən icra hakimiyyətinin başçısı olsa da, onun səlahiyyətləri Konstitusiya ilə məhdudlaşdırılırdı.
- Fransa işğalçılıq məqsədilə müharibələrdən imtina edirdi.

Nəticəsi:

Fransada konstitusiyalı monarxiya dövrü başladı.

**1795-ci il Konstitusiyası**

- İcra hakimiyyəti beş nəfərdən ibarət olan və Məclis tərəfindən seçilən Direktoriyaya verilirdi.

Nəticəsi:

Fransada Direktoriya dövrü başladı.

11

# RUSİYA

Romanovlar, “Məclis Qanunnaməsi”, I Pyotr, “Şimal müharibəsi”, II Yekaterina, Yassı müqaviləsi

*XVII yüzilliyin əvvəlləri Rusiyada siyasi dağınıqlıq dövrü idi. Daxili çəkişmələr, sosial münaqişələr, xarici müdaxilələr və tez-tez baş verən hakimiyyət dəyişiklikləri vəziyyəti daha da ağırlaşdırırdı. Xalqın bütün təbəqələri birləşib bu problemlərə son qoydu. Nəticədə hakimiyyətə Romanovlar sülaləsi (1613–1917) gəldi.*

**XVII yüzilliyin ikinci yarısında sosial-iqtisadi vəziyyət.** XVII yüzilliyin ikinci yarısında Rusiyanın təsərrüfat həyatında yeni əlamətlər meydana gəlirdi. Bu, **əmtəə*** istehsalında özünü daha çox göstərirdi.



Əmtəə satış məqsədilə istehsal olunan məhsuldur.

Sənətkarlar artıq sifarişlə deyil, satmaq üçün məhsullar istehsal edirdilər. Lakin təhkimçilik münasibətləri kəndlilərin təsərrüfata marağına mənfi təsir edir, onu bazara deyil, torpağa bağlayırdı.

XVII yüzilliyin ikinci yarısında şəhərlər inkişaf edərək ticarət mərkəzlərinə çevrilirdi. Şəhərlərlə yanaşı, kənd yerlərində də satış üçün məhsullar istehsal edilirdi. Əkinçiliyin az inkişaf etdiyi bölgələrdə sənətkarlığa daha çox diqqət yetirilirdi. Kapitalizmin ilkin mərhələsi olan xırda əmtəə istehsalı muzdlu əməyin tətbiqinə əsaslanırdı. Bu xüsusiyyətlər burjua xarakteri daşıyırdı.

XVII yüzilliyin ikinci yarısında Rusiyada **manufakturalar*** yaranırdı.



Manufaktura əl əməyinə, əmək bölgüsünə və muzdlu əməyə əsaslanan kapitalist müəssisəsidir.

Manufakturalar əl əməyinə əsaslansa da, burada əmək bölgüsü və muzdlu əməkdən istifadə olunurdu. Bu da tədricən kapitalist münasibətlərinin inkişafına yol açırdı. Bu dövrdə Rusiyada silah istehsal etmək üçün xüsusi manufakturalar yaradılmışdı. Onlar, əsasən, dövlətin sifarişlərini yerinə yetirir, həm daxili, həm də xarici bazarlar üçün məhsullar istehsal edirdi. Bu manufakturaların əsas istehsalçı qüvvəsi muzdlu işçilər və təhkimli kəndlilər idi.




Manufakturanın xarakterik xüsusiyyətlərini müəyyən edin.

Bu dövrdə Rusiyada daxili ticarət xeyli artmışdı. Tacirlər ölkədə istehsal olunan məhsulları daha

uzaq məsafədə yerləşən bölgələrdə yüksək gəlirlə satırdılar. Bu da vahid ümum-Rusiya bazarının yaranmasına gətirib çıxardı.

Manufakturaların inkişafına dəstək məqsədilə xarici tacirlərə verilən güzəştlər ləğv edilir, **proteksionist*** tədbirlər həyata keçirilirdi.



*Proteksionizm* (müdafiə, himayə) daxili bazarı müdafiə etmək məqsədilə xaricdən gətirilən məhsulların məhdudlaşdırılmasına yönəlmiş dövlət siyasətidir.

XVII yüzilliyin ortalarında Rusiyada gömrük qanunu qəbul edildi. Qanuna əsasən daxili ticarət rüsumları ləğv edildi, xarici tacirlər daha yüksək gömrük rüsumları ödəməli oldu. "Yeni ticarət nizamnaməsi" ilə rus bazarlarında pərakəndə məhsullar satmaq xarici tacirlərə qadağan olundu. Bu qanunlar rus tacirlərinin mənafeyi üçün qəbul edilmişdi.

**XVII yüzilliyin ikinci yarısında siyasi vəziyyət.** XVII yüzilliyin ikinci yarısında Avropa ölkələrində kapitalist münasibətləri inkişaf etdiyi halda, Rusiyada feodal-təhkimçilik qaydaları daha da möhkəmlənirdi. İqtisadi-təsərrüfat əlaqələrinin möhkəmlənməsi siyasi əlaqələrin də möhkəmlənməsinə səbəb olurdu. Bu dövrdə Rusiyanı qeyri-məhdud hakimiyyətə malik olan çar idarə edirdi.

Mütləqiyyətin dayağı olan Zemstvo məclisləri tez-tez deyil, yalnız hökumətin təşəbbüsü ilə toplanırdı. Bu da çarın təkbaşına hakimiyyətinin möhkəmləndirilməsi ilə bağlı idi.

Təhkimçilik zülmünün güclənməsi və vergilərin artırılması üsyanlara səbəb olurdu. Lakin üsyanlar kortəbii və qeyri-mütəşəkkil olduğundan qısa zamanda hökumət tərəfindən yatırılırdı. Üsyanların baş verməsi hökuməti təhkimçilik hüququnun rəsmiləşdirilməsi prosesini başa çatdırmağa vadar edirdi. 1649-cu ildə **"Məclis Qanunnaməsi" adlanan yeni qanunlar toplusu** qəbul olundu.

Feodal-təhkimçilik münasibətlərinin möhkəmləndirilməsinə xidmət edən bu qanunlar toplusu ilə kəndlilər qəti olaraq torpağa təhkim edilir, kəndlinin bir sahibkarın yanından başqa sahibkarın yanına getməsi qadağan olunurdu. Zadəgan mülklərinin irsən keçməsi hüququ isə təsdiq edilirdi. "Qanunnamə" həmçinin şəhərlərdə yaşayan əhalinin də vəziyyətini ağırlaşdırırdı.

Beləliklə, "Məclis Qanunnaməsi" ilə Rusiyada:

- təhkimçilik asılılığının rəsmiləşdirilməsi prosesi başa çatdı;
- kəndlilərin təhkimçilik asılılığına düşməsi hüquqi şəklə salındı;
- əhalinin zülm və əsarətə qarşı müqavimətini qırmaq üçün təhkimçi hakimiyyət orqanları formalaşdırıldı.

**XVII yüzilliyin ikinci yarısında Rusiyanın xarici siyasəti.** XVII yüzilliyin ikinci yarısında Ukrayna və Belarusiya torpaqlarının birləşdirilməsi, Baltik dənizi sahillərinə çıxışın əldə edilməsi və Qara dəniz sahillərinə yiyələnmək xarici siyasətdə Rusiyanın əsas məqsədləri idi.

XVII yüzilliyin ortalarında Ukrayna və Belarusiya Reç Pospolita dövlətinin tərkibində idi.

Təhkimçilik zülmündən əziyyət çəkən xalq feodalların yanından qaçaraq sərhəd bölgələrində məskunlaşır, azad kəndlilərə – kazaklara çevrilirdi. Yerli əhali zülmə qarşı azadlıq uğrunda mübarizə aparırdı. Belə vəziyyətdən Rusiya məharətlə istifadə etdi.




Bartolda görə, "kazak" sözü türkcə "quldur, sakitliyi pozan" mənasını verir. Bu söz milliyyəti deyil, davranış xüsusiyyətini, fəaliyyəti əks etdirir. Kazaklar, əsasən, XIV–XVII yüzilliklərdə Ukrayna və indiki Rusiyanın cənubunda feodalların və mülkədarların zülmündən qaçaraq azad olmuş təhkimli kəndlilər idi.



Ukrayna xalqının milli azadlıq mübarizəsinə kazakların başçısı Boqdan Xmelnitski rəhbərlik edirdi. O, yüksək təhsil almış və bir çox dilləri öyrənmişdi. Türklərlə döyüşlərdə atası ilə birlikdə iştirak etmişdir.

Kazaklardan biri kimi polyakların özbaşınalığına qarşı mübarizə aparmış və onları bir neçə döyüşdə məğlub etmişdir. Sonra kazakların başçısı seçilmiş və digər bölgələrə səfərlər edərək ətrafına xeyli sayda insan toplaya bilmişdi. Çıxışlarında dini amil önə çəkilirdi. Belə ki polyaklar katolik, yerli əhali isə pravoslav idi.



***Boqdan Xmelnitski***

1654-cü ildə Ukrayna uğrunda Reç Pospolita ilə müharibə başlandı və 1667-ci ildə Rusiyanın qələbəsi ilə başa çatdı. Əldə olunan razılığa əsasən Kiyev daxil olmaqla Solsahil Ukraynası və Belarusiyanın bir hissəsi Rusiyaya verildi. Osmanlı dövləti ilə aparılan mübarizə nəticəsində Rusiya bu ərazilərin əlində qalmasını təmin etdi. Lakin XVII yüzillikdə Qara və Baltik dənizlərinə çıxış əldə edə bilmədi.

1683-cü ildə Osmanlı dövlətinin Vyana səfəri Avropa dövlətlərinin bir qisminin Roma papasının rəhbərliyi ilə ona qarşı birləşməsinə səbəb oldu. Belə bir şəraitdə Reç Pospolita Rusiyanı antitürk cəbhəsinə cəlb etmək üçün fəaliyyətə başladı. Bu proses 1686-cı ildə Reç Pospolita və Rusiya arasında müqavilə imzalanması ilə başa çatdı.



Bəhs olunan məlumatlar hansı ittifaqın fəaliyyətinə aiddir?



Yaranmış vəziyyət Rusiyanın Osmanlı dövlətinə qarşı fəaliyyətini genişləndirsə də, uğursuz oldu. Krımı ələ keçirmək üçün edilən yürüşlər də heç bir nəticə vermədi.

**Rusiya XVIII yüzilliyin birinci yarısında.** XVII yüzilliyin sonlarında Rusiya Avropa ölkələri ilə müqayisədə xeyli geri qalırdı. Bu da Rusiyada islahatların keçirilməsi zərurəti yaratmışdı. I Pyotr (1682–1725) ilk vaxtlar hərbi məsələlərə çox fikir verirdi. O, ilk növbədə, Qara dəniz sahillərini ələ keçirmək, gələcəkdə də İstanbulu, Bosfor və Dardanel boğazlarını tutaraq Aralıq dənizinə çıxmağa can atırdı.

*I Pyotr*



XVII yüzilliyin sonlarında cənuba yürüş zamanı Azov qalası ələ keçirildi. Azov qalasının ələ keçirilməsi ilə müharibə başa çatmadı. Osmanlıların güclü hərbi donanması yenə də Qara dənizdə təkbaşına hökmranlıq edirdi. I Pyotr gələcəkdə Osmanlı ilə müharibəni davam etdirmək üçün müttəfiqlər axtarmağa başladı. Bu məqsədlə Qərbi Avropaya "Böyük elçilik" göndərdi. Pyotr özü də başqa adla nümayəndəliyin tərkibində Avropaya gedərək gəmiqayırma, artilleriya işini, Avropa qayda-qanunlarını öyrənirdi.



XVII yüzilliyin 80–90-cı illərində Rusiyanın Osmanlı dövlətinə qarşı apardığı mübarizənin nəticələrini müəyyən edin.

I Pyotr Avropa dövlətlərinin Osmanlıya qarşı ittifaqını təmin edə bilməsə də, Reç Pospolita, Saksoniya və Danimarka ilə İsveçə qarşı ittifaq yaratdı. Bu, Şimal ittifaqı idi.

Şimal ittifaqının yaradılması ilə Rusiya Baltik dənizinin sahillərini ələ keçirmək uğrunda mübarizəyə başladı. Şimal ittifaqı ilə İsveç arasında 1700-cü ildə **Şimal müharibəsi** adlanan müharibə başladı. Müharibənin ilk vaxtları müttəfiqlər üçün uğursuz oldu. I Pyotr Rusiyanın geriliyini aradan qaldırmaq üçün dərhal islahatlara başladı. Aparılan islahatlar növbəti əməliyyatlarda öz bəhrəsini verməyə başladı.

1709-cu ildə baş verən **Poltava** döyüşündə rus ordusu qalib gəldi. İsveç kralı XII Çarlz qaçaraq Osmanlı torpaqlarında gizləndi. Poltava döyüşü Şimal müharibəsinin gedişində əsaslı dönüş yaratdı.



*XII Çarlz*

I Pyotr 1711-ci ildə İsveç kralını təqib etmək bəhanəsi ilə Qara dəniz ətrafı Osmanlı torpaqlarına hücum etdi. Lakin Prut çayı sahilində mühasirəyə düşdü. I Pyotr düşdüyü mühasirədən çıxmaq üçün sülh bağlamağa çalışırdı. Osmanlı komandanı I Pyotrun mühasirədə olduğundan xəbərsiz idi və sülh bağlamağa razı oldu. Prut çayı sahilində imzalanan sülhə görə Rusiya Azov qalasını osmanlılara qaytardı və İsveç kralının ölkəsinə qayıtmasına şərait yaratdı.

Müharibə Rusiyanın üstünlüyü ilə başa çatdı. **1721-ci ildə Niştadt şəhərində Rusiya ilə İsveç arasında sülh müqaviləsi imzalandı.**

**I PYOTRUN PRUT SƏFƏRİ**

1 Rus ordusunun yürüş istiqaməti
2 Osmanlı ordusunun yürüş istiqaməti
3 Rusların geri çəkilməsi




AVSTRİYA

Belqrad



Krakova



**NİŞTADT SÜLHÜNÜN RUSİYA ÜÇÜN NƏTİCƏLƏRİ**

- Şimal müharibəsi Rusiyanın qələbəsi ilə başa çatdı.
- Baltik dənizi sahillərinə çıxış əldə etdi.
- Rusiya imperiya, I Pyotr isə imperator adlandırıldı.



**I Pyotrun islahatları.** Rusiyanın Avropa ölkələrindən geriliyi və Şimal müharibəsinin ilk illərində məğlubiyyəti islahatlar keçirilməsini zəruri edirdi.

I Pyotr hərbi islahatlara başladı. Qoşunların toplanması rekrut (əsgər) qaydası ilə həyata keçirildi. Rusiyada güclü daimi ordu və **ilk hərbi donanma** yaradıldı. Ordunun əsasını daimi piyada və süvari birləşmələri təşkil edirdi.

Silah istehsalının genişləndirilməsi üçün metallurgiya manufakturaları tikildi. Metallurgiyanın inkişafı artilleriyanın da inkişafına səbəb oldu. Süngülü tüfənglərin istehsalına başlanıldı.

XVIII yüzilliyin birinci yarısında idarəetmə orqanlarında da islahatlar keçirildi. İslahatların əsas mahiyyəti mütləqiyyətin dayağı olan zadəgan-məmur sistemini formalaşdırmaq idi. Əvvəlki idarəetmə orqanları sıradan çıxarılır, yeniləri ilə əvəz olunurdu. Bunlardan əhəmiyyətlisi icra və məhkəmə səlahiyyətləri olan Senat idi. Senatın üzvləri çar tərəfindən təyin olunurdu. Sonradan bu qurumun səlahiyyətləri artırılaraq dövlət orqanlarına nəzarət etməyə başladı.

I Pyotr mədəni sahədə də islahatlar keçirdi. Rusiya tarixində ilk dəfə teatr, qəzet, dövlət kitabxanası və Elmlər Akademiyası yaradıldı. Təqvim və əlifba islahatlarının keçirilməsi də I Pyotrun adı ilə bağlıdır.

I Pyotrun hakimiyyəti illərində xarici ticarət xeyli genişlənmişdir. Ölkə daxilində istehsalı gücləndirmək üçün dövlət himayə siyasəti həyata keçirir, xaricdən gətirilən məhsullara yüksək gömrük haqqı tətbiq edirdi.



I Pyotrun ticarətin inkişafı üçün atdığı addımları XVII yüzilliyin ortalarında qəbul edilən ticarət qanunları ilə müqayisə edin və ümumi cəhətlərini müəyyən edin.

I Pyotrun islahatları Rusiyanın Avropa ölkələrindən geriliyini xeyli azaltdı. İnzibati dəyişikliklər isə mütləq monarxiyanın formalaşmasını başa çatdırdı.



Mətnə əsasən I Pyotrun islahatlarını qruplaşdırın.




**Rusiya XVIII yüzilliyin ikinci yarısında.** II Yekaterinanın hakimiyyəti dövründə (1762–1796) daxili çəkişmələrə son qoyuldu və I Pyotrun dövründə formalaşan siyasi ənənələr davam etdirildi.



*II Yekaterina*

Bu dövrdə Rusiyanın xarici siyasətində işğalçılıq meyilləri xeyli artdı. Rusiyanın xarici siyasətinin ana xəttini Qara dəniz sahillərinə yiyələnmək təşkil edirdi.

XVIII yüzilliyin ortalarında Rusiyanın Polşa torpaqlarının bir hissəsini ələ keçirməsi və burada qüvvətlənməsi Rusiya ilə Osmanlı arasında münasibətləri kəskinləşdirdi. İngiltərə və Fransa da baş verən hadisələrə Osmanlı vasitəsilə müdaxilə etmək istəyirdi. Onlar Osmanlı dövlətini inandırdılar ki, Rusiyaya qarşı müharibəyə başlasa, ona kömək edəcəklər. Beləliklə, Osmanlı dövləti İngiltərə və Fransanın təhriki ilə 1768-ci ildə Rusiyaya müharibə elan etdi.

Hərbi əməliyyatlarda üstünlük Rusiyanın tərəfində idi. Bundan narahat olan Avropa dövlətləri Rusiyaya təzyiq etməyə başladı. Ölkə daxilində kəndli çıxışları baş verdiyindən Rusiya sülh danışıqlarına başlamağa məcbur oldu. Müharibə 1774-cü ildə Kiçik Qaynarca müqaviləsinin imzalanması ilə başa çatdı. Müqavilə nəticəsində Rusiya öz məqsədinə çataraq tarixində ilk dəfə Qara dənizdə üzmək, Bosfor və Dardanel boğazlarından sərbəst keçmək hüququ qazandı. Həmçinin müqaviləyə əsasən Osmanlı dövləti Krım xanlığının müstəqilliyini tanıdı. Bununla da Krım xanlığının işğalı üçün şərait yaranmış oldu. Rusiya Osmanlı imperiyasında yaşayan pravoslavlar üzərində güzəştlər qazandı. Bu isə onları Osmanlıya qarşı təhrik etməyə şərait yaratdı.





1686-cı il Rusiya-Reç Pospolita və 1774-cü il Rusiya-Osmanlı müqavilələrinin oxşar cəhətlərini müəyyən edin.

Kiçik Qaynarca müqaviləsi ilə Krım xanlığı təklənmiş oldu. Burada baş verən daxili qarışıqlıqdan istifadə edən Rusiya 1783-cü ildə Krımı işğal etdi. Ardınca Şərqi Gürcüstan da Rusiyanın himayəsinə keçdi.

II Yekaterina anlayırdı ki, Osmanlı Krımın işğalı ilə barışmayacaq. Ona görə də Osmanlı ilə baş verə biləcək müharibəyə hazırlıq gördü. Avstriya ilə ittifaq bağladı, yeni donanmalar yaradıldı və qalalar tikildi.

Rusiyanı zəiflətmək istəyən Avropa dövlətləri Osmanlı dövlətini 1787-ci ildə növbəti müharibəyə təhrik etdi. Bu müharibə də Osmanlının məğlubiyyəti ilə başa çatdı. 1791-ci ildə Yassı müqaviləsi imzalandı. Müqaviləyə əsasən Osmanlı dövləti Cənubi Buqdan Dnestr çayına qədər olan Qara dəniz sahillərinin, Krımın və Şərqi Gürcüstanın Rusiyanın himayəsində olmasını qəbul etdi. **Beləliklə, Rusiya Qara dəniz sahillərində qəti olaraq möhkəmləndi.**



Kiçik Qaynarca və Yassı müqavilələrinin Rusiya üçün ümumi nəticələrini müəyyən edin.

Şəhərlər
Buq
Dnestr
Dnepr
Yassı
Bender
Oçakov
Kinburn
Hacıbəy
Akkerman
Fokşan
İsmayıl
QARA DƏNİZ

Yassı müqaviləsinə görə Rusiyaya keçən ərazilər (şrtixlənmiş ərazilər)

Şərqi Gürcüstanın Rusiyanın himayəsinə keçməsi, ardınca Yassı müqaviləsi ilə Osmanlı dövlətinin zərərsizləşdirilməsi Rusiyanın Azərbaycana siyasi təsirini gücləndirdi. Azərbaycan inkişaf etməkdə olan Rusiya manufaktura sənayesi üçün ən əlverişli xammal mənbəyi və satış bazarı ola bilərdi. Azərbaycan həm də öz coğrafi mövqeyinə görə Rusiyanın Şərq ölkələri ilə yaratmaq istədiyi iqtisadi əlaqələr üçün də əsas hərbi-strateji məkan idi. Rusiya bu maraqlarını həyata keçirmək üçün Qacar təhlükəsini bəhanə edərək 1796-cı ildə Cənubi Qafqaza qoşun yeritdi. Ancaq II Yekaterinanın ölümü və hakimiyyətə gələn oğlu I Pavelin rus qoşunlarını geri çəkməsi Rusiyanın planlarını yarımçıq qoydu.


*I Pavel*

**S**

Sizcə, XVIII yüzillik ərzində Rusiya nəzərdə tutduğu məqsədlərini həyata keçirə bildimi? Fikrinizi əsaslandırın.

| RUSİYA İMPERİYASI | | | | | |
|---|---|---|---|---|---|
| | 1547 | 1605 | 1689 | 1645–1689 | 1725 |

12

# MƏDƏNİYYƏT

Maarifçilik, Moskva Universiteti, Nyuton, Lomonosov, Molyer, Radişşev, Versal sarayı, Motsart

*Avropa mədəniyyətində baş verən İntibah Şərq ölkələri ilə müqayisədə onun irəliyə doğru böyük məsafə qət etməsinə səbəb oldu. XVII–XVIII yüzilliklərdə Avropa xalqlarının mədəni həyatında inqilabi dəyişikliklər baş verdi. Təhsilin, elmin və mədəniyyətin digər sahələrinin inkişafında maarifçilər mühüm rol oynadılar.*

**Maarifçilik.** Kapitalizmin inkişafı, burjua münasibətlərinin formalaşması dövrün ictimai-siyasi hadisələrindəki dəyişikliklər özünü mədəniyyətin inkişafında da göstərdi. XVII–XVIII yüzilliklərdə Avropa sivilizasiyası güclü elmi-texniki inkişaf sürəti əldə etdi. Fransa və İngiltərədə baş verən burjua inqilabları yeni dünya quruculuğu prinsiplərini müəyyənləşdirdi, şəxsiyyət aləminə maraq gücləndi. Məhz insanların Allah və dövlət qanunları qarşısında bərabərliyi fikri yaranmağa başladı. Dünyanı şüurlu surətdə dəyişdirmək və yenidən qurmağın mümkünlüyünə istinad edən dünyagörüş inkişaf etməyə başladı. Bu din ilə elm arasında mübarizənin genişlənməsinə səbəb oldu. Mədəniyyətin digər sahələrində də mürəkkəb dəyişikliklər baş verdi. Həmin dövr milli mədəniyyətin formalaşması dövrü kimi tanındı. Mədəniyyət sahələrinin tərkib hissələrinə ayrılması, müstəqilləşməsi mərhələsi başlandı. Bu həm də müstəqil bədii üslubların formalaşmasına istiqamət verdi.

Beləliklə, Avropa ölkələrində insanların mədəni həyatında dönüş yaradan yeni prinsiplər meydana gəldi. Bu dövrün mənəvi mədəniyyətinin əsas yeniliklərindən biri elmi fəaliyyətə əsaslanan təfəkkür tərzinin formalaşmasıdır. Elmi fəaliyyət səmərəli, sistemli, təcrübəyə əsaslanma istiqamətində quruldu. Dünyanın elmi şəkildə dərk edilməsində insanın rolu və yeri müəyyən edildi. Dünya elmlərlə silahlanmış ağıl əsasında dərk edilməyə başladı. Dünyanın bu cür dərk edilməsi cəhdi **rasionalizm*** adlandı. Bu ideyaya görə cəmiyyət, insanların münasibəti, əxlaq qaydaları, dövlət ağıllı və səmərəli əsaslar üzərində qurula bilər. Rasionalizmə əsasən ağıl insanlara doğularkən digər təbii imkanlar kimi verilir.



*Rasionalizm* – ağlı idrakın yeganə mənbəyi hesab edən fəlsəfi cərəyandır.




XVII–XVIII yüzilliklərdə Avropa mədəniyyətinin inkişaf xüsusiyyətlərini müəyyən edin.

XVIII yüzillik tarixə "Maarifçilik" dövrü kimi daxil olmuşdur. İngiltərə inqilabının təsiri ilə yaran-

mış maarifçilik tədricən digər Avropa ölkələrinə və Rusiyaya yayıldı. Bu sahədə Fransa maarifçiləri daha çox fərqlənirdi. Dövrün ziyalıları mədəni və sosial inkişafın əsas yolunu təhsilin inkişafında görürdülər.

Maarifçilər xalqın maariflendirilməsinin, əqlin inkişafının cəmiyyət həyatının bütün sahələrinin inkişafına nüfuzedici təsir göstərəcəyinə inanırdılar .



***Lokk***



***Didro***

Maarifçilər öz təbliğatlarında insanları savadlandırmaq, onlarda fikir azadlığı formalaşdırmaq, müstəqil düşüncə tərzi, cəsarət tərbiyə etmək məqsədi güdürdülər.

Bu dövrdə İngiltərədə Lokk, Almaniyada Höte, Fransada Monteskyö, Volter, Didro, Russo kimi mütəfəkkirlər yetişdi.

Maarifçilik mədəniyyəti öz elmliliyi ilə fərqlənirdi. Alimlərin əməyi sayəsində elmi idrakın və dünyagörüşün əsası qoyuldu. Təbiət hadisələrinin təbii başvermə səbəblərini izah etmək zərurəti dərk edildi.




Avropa maarifçilərinin əsas məqsədləri nə idi?

**Təhsil.** XVII–XVIII yüzilliklərdə maarifçilik ideyalarının geniş yayılması Avropada təhsilin inkişafına böyük təsir göstərdi. İngiltərədə olan klassik tipli tədris müəssisələri qrammatika məktəbləri idi. Bu məktəblərin arasında London, Vestminster və başqaları daha çox fərqlənirdi. Belə böyük məktəblərdə oxuyan şagirdlərin sayı bəzən 3000 nəfərə çatırdı. İngilis qrammatika məktəbləri, onların bir növü olan kütləvi məktəblər şəhər məktəb və gimnaziyalarının mənsub olduğu eyni tip tədris müəssisələrinə daxil idi.



*London XVII yüzillikdə*

XVII yüzilliyin əvvəllərində Fransanın şimalında (Paris, Tuluza, Şampan) fəalliyyət göstərən kolleclərdə 25 minə yaxın şagird təhsil alırdı. XVII yüzilliyin ikinci yarısında Parisdə 160-dan çox bələdiyyə məktəbi və ibtidai təhsil verən 40 məhəllə məktəbi var idi. Fransada ümumtəhsil məktəblərinin əsas tipi kollec idi.

XVIII yüzilliyin ortalarında Fransada böyük şagird kontingenti olan müqəddəs Loyola kollecində ildə 14 minə yaxın şagird oxuyurdu. Fransadakı məktəblər bütün Avropada məşhur idi. Ölkənin ali təhsil sistemində Paris universiteti xüsusi rol oynayırdı. Burada ilahiyyat və fəlsəfənin tədrisinə xüsusi yer verilirdi.

Almaniya ərazisində təhsilin tipik nümunələri klassik tipli tədris müəssisələri olan şəhər latın məktəbi və gimnaziya idi. XVIII yüzilliyin əvvəllərində təkcə Prussiyada 380 şəhər məktəbi və gimnaziya var idi. İlk zamanlar tədris saatlarının əsas hissəsi antik dillərin və ədəbiyyatın öyrənilməsinə ayrılırdı. Müasir təhsil verən şəhər məktəbləri və gimnaziyalar isə başqa istiqamətdə fəaliyyət göstərirdi. 1763-cü ildə Almaniyada ilk dəfə icbari ibtidai təhsil yaradıldı.




Avropa ölkələrinin təhsil sistemlərini müqayisə edin, onların oxşar və fərqli cəhətlərinə aid cədvəl qurun.

Rusiyada yenidən qurulan təhsil sistemində dəqiq elmlərin tədrisinə önəm verilirdi. XVIII yüzilliyin əvvəllərində Moskvada naviqasiya, artilleriya, mühəndislik və tibb məktəbləri



açıldı. Peterburq Dəniz Akademiyası yaradıldı. 1755-ci ildə Moskva Universitetinin əsası qoyuldu.

Şimali Amerikada məktəb təhsili Avropa təhsil sisteminin təsiri altında inkişaf edirdi. Burada ilk ibtidai təhsil müəssisələri puritan icmalarında yaranmağa başladı. Belə məktəblərin fəaliyyətini tənzimləmək üçün 1647-ci ildə Massaçusets ştatında ibtidai məktəb sisteminin əsasını qoyan ilk qanun qəbul edilmişdir. Ona qədər ilk şəhər məktəbi Bostonda açılmışdı. XVIII yüzilliyin 70-ci illərində Şimali Amerikanın koloniyalarında yeni tipli ümumtəhsil məktəbləri yaradıldı və bunlar akademiya adlanırdı.

Milli maarif sistemi istiqlaliyyət uğrundakı müharibədən sonra təşəkkül tapmışdır. 1779-cu ildə T.Cefferson tərəfindən hazırlanan və məktəbə pulsuz, ümumicbari status verən təhsil layihəsi dərc olundu. Onun təşəbbüsü ilə üçpilləli ümumtəhsil məktəb modeli hazırlandı. Bu modeli o dövrdə Amerika məktəblərində kök salmış Avropa təhsil sistemindən uzaqlaşmaq istiqamətində ilk cəhd hesab etmək olardı.

Ölkədə yeganə ali məktəb Harvard Universiteti idi.

***Moskva Universitetinin qədim binası***



*Harvard Universiteti (müasir görünüşü)*

T

Rusiya və Şimali Amerika təhsilində baş verən yeniliklərə aid cədvəli doldurun.

| Rusiya | Şimali Amerika |
| --- | --- |
| | |
| | |

**Elm.** Təhsil sahəsində tətbiq olunan yeniliklər müxtəlif elmlərin tərəqqisinə səbəb oldu. Manufakturaların və ticarətin inkişafı da bu məsələyə təsirsiz ötüşmədi.

İngilis alimi İsaak Nyutonun başlıca xidmətlərindən biri dünya cazibə qanununu kəşf etməsidir. O bu qanunu Günəş sistemi planetlərinin hərəkətlərini izah etmək üçün tətbiq etdi. Nyuton alman alimi Qotfrid Leybnitslə birlikdə ali riyaziyyatın əsasını qoydu.

*İsaak Nyuton*





Niderland alimi Antoni Levenhukun baxılan cismi 150-300 dəfə böyüdən linza ixtira etməsi bakteriyaları aşkara çıxarmağa imkan verdi. İngilis alimi Edvard Cenner çiçək xəstəliyinə qarşı hazırladığı peyvəndi öz ölkəsində tətbiq etməyə başladı.

Bu dövrdə Rusiyada elmin müxtəlif sahələri inkişaf edirdi. Rus coğrafiyaçıları Kuril adalarını, Alyaska yarımadasını kəşf etdilər.

***Antoni Levenhuk***



***Qotfrid Leybnits***



***Edvard Cenner***



*Peterburq Elmlər Akademiyası (müasir görünüşü)*



*M.V.Lomonosov*

1725-ci ildə Peterburq Elmlər Akademiyası fəaliyyətə başladı. Bu, rus elminin və mədəniyyətinin bu dövrdəki ən böyük nailiyyəti idi.



Şərq və Qərb mədəniyyətlərinin inkişaf xüsusiyyətlərini izah edin.

Fiziki kimyanın yaradıcısı, ilk kimya laboratoriyasının təşkilatçısı M.Y.Lomonosovun XVIII yüzillik Rusiya elminin inkişafında müstəsna xidməti olmuşdur. Lomonosov kimyəvi reaksiyalar zamanı maddələrin ümumi çəkisinin dəyişmədiyini sübut etmişdi.

Dövrün hadisələri tarixi əsərlərdə öz əksini tapırdı. Bu dövrdə beşcildlik Rusiya tarixi yazıldı. N.Karamzin məşhur tarixçi idi.

Şimali Amerikada elmin görkəmli nümayəndələrindən biri kimi tanınan məşhur siyasi



N.M.Karamzin



B.Franklin

xadim B.Franklin elektrik sahəsinə aid bir çox tədqiqatların müəllifi idi. O, Filadelfiyada elm həvəskarlarının klubunu yaratmışdı.



Müxtəlif elm sahələrinin inkişafında rolu olan alimlərin adlarını cədvələ yazın.

| | |
|---|---|
| Tarix | |
| Fizika | |
| Kimya | |
| Riyaziyyat | |
| Tibb | |

**Ədəbiyyat.** XVII–XVIII yüzilliklərdə kapitalist münasibətlərinin təsiri altında Hollandiya və İngiltərədə, sonra isə başqa ölkələrdə də bədii ədəbiyyatda burjuaziya ideyaları yayılmağa başladı. Bir çox qabaqcıl yazıçılar mütləq monarxların özbaşınalığını cəsarətlə ifşa edirdilər. Onlar saray əyanlarını, kilsəni tənqid edir, cəmiyyətin inkişafına mane olan buxovlardan onun azad olmasına çalışırdılar. Belə qabaqcıl ziyalılardan biri məşhur ingilis yazıçısı Daniel Defo olmuşdur. Yazdığı "Robinzon Kruzo" romanı ona misilsiz şöhrət qazandırmışdı.

Böyük ingilis satiriki Conatan Svift "Qulliverin səyahətləri" romanında cəmiyyətdə hökm sürən lovğalıq, özbaşınalıq, acgözlük, hər şeydən şübhələnmək və ədalətsizlik kimi xüsusiyyətləri tənqid atəşinə tuturdu.



Ədəbiyyat sahəsində baş verən yeniliklər nə ilə bağlı idi?

Böyük fransız dramaturqu Jan Batist Molyer komediyalarında zadəganların avaraçılığını, silki imtiyazlarını və xurafatı məzəli tərzdə ifşa edirdi. Pyesləri bu gün də dünya teatrlarının səhnələrində oynanılan görkəmli alman dramaturqu Fridrix Şiller faciə əsərlərində yaşadığı dövrü tənqid edirdi.



*J.B.Molyer*



*F.Şiller*



Görkəmli fransız dramaturqu P.Bomarşe Fransa burjua inqilabı ərəfəsində aristokratların silki imtiyazlarına və hökmranlığına qarşı çıxış edirdi. O, "Fiqaronun toyu" komediyasında zadəganların bekarçılığını, miskinliyini və yelbeyinliyini göstərərək zirək, diribaş və ağıllı nökər obrazını yaratmışdı. Bu əsər tamaşaya qoyulduqdan sonra Bomarşeni həbs etmişdilər. Lakin onun şöhrəti o qədər böyük idi ki, bir neçə gündən sonra həbsxanadan buraxmalı olmuşdular.

Pyer Bomarşe Şimali Amerikada istiqlaliyyət mübarizəsi zamanı öz vəsaiti hesabına Amerika vətənpərvərlərinə köməyə göndərilmək üçün fransız zabitləri və hərbi sursat aparan gəmi təchiz etmişdi.



*P.Bomarşenin Bastiliya yaxınlığındakı evi*

Alman ədəbiyyatının görkəmli nümayəndəsi İ.V.Höte idi. O, insan yaradıcılığını tərənnüm edirdi. Bu bütün dünyada şöhrət qazanan və Hötenin başlıca əsəri olan "Faust"da özünün parlaq ifadəsini tapmışdı.



Dövrün yazıçılarının oxşar xüsusiyyətlərini müəyyən edin.



*İ.V.Höte*



*A.N.Radişşev*

Rusiyada feodal-təhkimçilik sistemi və mütləqiyyət əleyhinə yönəlmiş inqilabi ideologiyanın ən görkəmli nümayəndəsi A.N.Radişşev idi. Onun "Peterburqdan Moskvaya səyahət" əsəri böyük şöhrət qazanmışdı. Radişşev Rusiyada mütləqiyyətin devrilməsini və respublika qurulmasını təklif edirdi. Onun əsəri təhkimçiliyə və mütləqiyyətə qarşı mübarizəyə ilk inqilabi çağırış idi.




Sizcə, Radişşevin mütləqiyyətə qarşı belə çıxış etməsinin səbəbi nə idi?

**Memarlıq və incəsənət.** Kapitalizmin bərqərar olması dövründə elm və texnikanın müvəffəqiyyətləri böyük bina, körpülər və başqa tikintiləri əvvəlkindən sürətlə inşa etməyə imkan verirdi. XVII–XVIII yüzilliklərin memarlıq üslubu tarixdə barokko adı ilə məşhurdur. Romadakı Müqəddəs Pyotr kilsəsi barokko üslubunda inşa edilmiş memarlıq əsərlərinin ən yaxşı nümunəsidir. Fransada inşa olunmuş Versal sarayı öz əzəməti ilə görənləri heyran edirdi. Versalın ən məşhur salonu Güzgülü salondur.

*Müqəddəs Pyotr kilsəsi*







*Versal sarayı*

M.Kazakov məşhur rus memarı idi. O, Moskva Universitetinin köhnə binasını və Kremldəki senatı inşa etmişdi. Bu dövrün ən məşhur memarlıq abidələrinə Moskvadakı Lefort sarayını və Peterburqdakı Petropavlovsk kilsəsini nümunə göstərmək olar.



*Lefort sarayı*



*Kreml senatı*

Meksikada memarlıq və şəhərsalma sürətlə inkişaf edirdi. Memarlıqda barokko üslubu üstün idi.



Avropa və Rusiyada inşa olunmuş memarlıq abidələrinə aid cədvəli doldurun.

| | |
|---|---|
| Avropa | |
| Rusiya | |



*Petropavlovsk kilsəsi*

Öz yüksəliş dövrünü yaşayan Avropa musiqisi dünyaya İ.Bax, V.Motsart kimi görkəmli bəstəkarlar bəxş etmişdir. Motsartın operaları bu gün də bir çox ölkələrin səhnələrində tamaşaya qoyulur.

Dövrün ideyaları rəssamlıq əsərlərində də öz əksini tapırdı. Fransız rəssamı Jak Lui Davidin rəsmləri, əsasən, inqilab mövzularına həsr olunmuşdu.



*V.Motsart*



*J.L.David*



*İ.Bax*

Mədəniyyətin mühüm sahələrindən biri olan teatr sənəti də inkişaf edirdi. 1702-ci ildə Moskva teatrı fəaliyyətə başladı. Teatrın açılması mədəniyyətin inkişafına böyük təkan verdi.

Meksikada teatr sənətinin əsasını qədim hindu dini mərasimləri təşkil edirdi. İlk kütləvi teatr tamaşası Mexikoda göstərilmiş, sonra başqa şəhərlərdə də teatrlar meydana gəlmişdi.

1751-ci ildə Şimali Amerikada da teatr yaradıldı və bu, milli dramaturgiyanın formalaşmasına böyük təsir göstərdi.




Mədəniyyətin inkişafında teatrın rolu nədən ibarətdir?



Volfqanq Amadey Motsart Avstriyanın Zalsburq şəhərində doğulmuşdu. Beş yaşı olanda fövqəladə musiqi istedadına malik Motsart haqqında söhbətlər bütün Avropaya yayılmışdı. Onun qeyri-adi ifaçılıq ustalığı, fitri istedadı təkcə musiqi həvəskarlarını deyil, eləcə də məşhur bəstəkarları heyrətləndirirdi. Bir çoxları etiraf edirdilər ki, bu oğlan onların hamısını kölgədə qoyacaq.

Bu dahi oğlan haqqındakı hekayətlər əfsanəyə bənzəyirdi. Qəzetlər onun Almaniya, İngiltərə, İsveçrə, İtaliya və Fransadakı qeyri-adi konsertləri barədə məlumat verirdi. Fransızlar 6 yaşlı bəstəkara hörmət əlaməti olaraq onun əsərlərinin not yazılarını kitabça halında nəşr etdirmişdilər. Motsart çox işləyirdi. O, bəzən gündə iki konsert verir, gecələr isə musiqi bəstələməyə məcbur olurdu.

Hələ 14 yaşında ikən akademiyaya üzv seçilən Motsart Avropa ölkələrinin musiqisi ilə yaxından tanış olmuşdu. Ümumiyyətlə, başqa xalqların nəğmələri xoşuna gəlirdi. Motsartın "musiqi səyahətləri" onun üçün ciddi və mühüm məktəb idi. Sonralar o yazırdı: "Heç kim musiqi bəstələmək qanunlarının öyrənilməsinə mənim qədər əmək sərf etməyib. Mən bütün məşhur bəstəkarların musiqi əsərlərini böyük səy və diqqətlə öyrənmişəm".

Motsartın ilk müəllimi atası olub. O, məşhur pedaqoq, bəstəkar və əla skripkaçı, çox işgüzar, lakin xasiyyətcə bir qədər soyuq təbiətli adam idi. Volfqanqa daha çox anasının xasiyyəti keçib. O, hər şeyə tez inanan, adamlarla asanlıqla dil tapan, məişət məsələlərindən az baş çıxaran insan idi. Motsart vəzifə və pul xatirinə zadəgan və əyanlar qarşısında əyilməmiş, saray musiqiçisinin nökər vəziyyəti ilə heç vaxt barışmamışdı.

O, 26 yaşında ikən doğma Zalsburqu tərk edib, Vyanada müstəqil həyata başlayıb. Əsil musiqi həvəskarları Motsartın bəstələdiyi simfoniyalar və sonatalara, "Fiqaronun toyu", "Don Juan", "Sehrli fleyta" operalarına valeh idilər.

Motsart öz vətəninin musiqisini yüksəklərə qaldırmaq arzusunda idi. Lakin onun rəqibləri Motsartın yaradıcılıq fəaliyyətini məhdudlaşdırmağa cəhd göstərirdilər.

Daim maddi ehtiyac və mənəvi sıxıntı içərisində yaşaması, haqsız təhqirlərə məruz qalması Motsartın səhhətini pozub və onun erkən ölümünə səbəb olub. Dahi bəstəkar Vyanada dəfn olunub.

## Buraxılış məlumatı

**ÜMUMİ TARİX 8**

*Ümumi təhsil müəssisələrinin 8-ci sinifləri üçün*
*Ümumi tarix fənni üzrə*

**DƏRSLİK**

**Tərtibçi heyət:**

Müəlliflər: **Kərim Şükürov**
**Pərviz Ağalarov**
**Niyaməddin Quliyev**
**Kərəm Məmmədov**
**Talıb Talıblı**
**Elnur Hüseynov**

Buraxılışa məsul **Rafiq Kazımov**
Dizayner və səhifələyici **Bəxtiyar Ələkbərov**
Multimedia mütəxəssisləri: **Yusif Qabilov**
**Kənan Yusifzadə**
Xəritələrin işlənməsi **Sufi Səfərli**
Redaktor və korrektor **Nigar Əliyeva**
Texniki redaktor **Sevinc Yusifova**
Baş redaktor **Samirə Bektaşi**
Texniki direktor **Allahverdi Kərimov**
Nəşriyyat direktoru **Sevil İsmayılova**

Rəqəmsal mobil texnologiyaların (animasiyalar, multimedia və QR kodlar) dərslik və metodik vəsaitlərdə istifadəsinin ideya müəllifi **Rafiq Kazımov**





**Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyinin qrif nömrəsi: 2023-041**





Hesab-nəşriyyat həcmi 12,5. Fiziki çap vərəqi 17,5. Formatı $57x82^1/_8$.
Kəsimdən sonra ölçüsü: 195x275. Səhifə sayı 140.
Şriftin adı və ölçüsü: məktəb qarnituru 10-12. Ofset kağızı. Ofset çapı.
Sifariş . Tiraj . Pulsuz. Bakı – 2023

**Əlyazmanın yığıma verildiyi və çapa imzalandığı tarix: 16.06.2023**

Çap məhsulunu nəşr edən:
**"Şərq-Qərb" ASC**
**(Bakı, AZ1143, Hüseyn Cavid pr., 111)**

Çap məhsulunu istehsal edən:

Pulsuz

## Əziz məktəbli!

**Bu dərslik sizə Azərbaycan dövləti tərəfindən bir dərs ilində istifadə üçün verilir.**

**O, dərs ili müddətində nəzərdə tutulmuş bilikləri qazanmaq üçün sizə etibarlı dost və yardımçı olacaq.**

**İnanırıq ki, siz də bu dərsliyə məhəbbətlə yanaşacaq, onu zədələnmələrdən qoruyacaq, təmiz və səliqəli saxlayacaqsınız ki, növbəti dərs ilində digər məktəbli yoldaşınız ondan sizin kimi rahat istifadə edə bilsin.**

**Sizə təhsildə uğurlar arzulayırıq!**





